*Millətimi saz anladar, saz anlar,*
*Saza baxsın tariximi yazanlar.*

*Zəlimxan Yaqub*
*Xalq şairi*

# OZAN DÜNYASI

**№ 2 (30)**
**2018**

# AZƏRBAYCAN AŞIQLARININ VI QURULTAYI KEÇİRİLDİ

**Sentyabrın 28-də Rəşid Behbudov adına Azərbaycan Dövlət Mahnı Teatrında Azərbaycan Aşıqlarının VI qurultayı keçirildi.**




Qurultayı Xalq şairi **Nəriman Həsənzadə** açaraq aşıq sənətinin xalqımızın mədəni həyatında oynadığı roldan danışdı, tədbir iştirakçılarını təbrik edib, uğurlar arzulad və Qurultaya sədrlik etmək üçün Milli Məclisin Mədəniyyət komitəsinin sədri, akademik **Rafael Hüseynovun** namizədliyini irəli sürdü. Təklif səsə qoyuldu və yekdilliklə qəbul olundu. Qurultaya sədrlik edən Milli Məclisin Mədəniyyət komitəsinin sədri, akademik Rafael Hüseynov aşıq sənəti haqqında dərin məzmunlu çıxış etdi. Azərbaycan Aşıqlarının ilk qurultayının 1928-ci ildə keçirildiyini diqqətə çatdıran R.Hüseynov bu gün altıncı qurultayın gerçəkləşməsinin əlamətdar hadisə olduğunu vurğuladı. Bildirdi ki, aşıq sənəti həm də millətin böyük amallarının ifadəsidir: "Sevindirici haldır ki, Prezident İlham Əliyevin və Birinci vitse-prezident Mehriban Əliyevanın aşıq sənətinə diqqət və qayğısı çox yüksəkdir. Mehriban xanımın UNESCO-nun xoşməramlı səfiri kimi bilavasitə səyləri nəticəsində Azərbaycan aşıq sənəti bu təşkilat tərəfindən bəşəriyyətin qeyri-maddi mədəni irs siyahısına daxil edilib. UNESCO-nun irs

siyahısına ölkəmizin 11 nominasiyası daxil edilib. Daha bir neçə nümunə ilə bağlı iş gedir. İnanıram ki, onların da UNESCO-nun siyahısına salınması reallaşacaq".

Vurğulandı ki, bu gün aşıq sənəti özünün əvvəlki şöhrətini bərpa etməkdədir. Bu sənət növü artıq bəşəri sənət kimi qorunur.

Sonra qurultayın mandat komissiyasının sədri, Əməkdar mədəniyyət işçisi **Elxan Məmmədlinin** hesabatı dinlənildi.



Qurultayda çıxış edən Mədəniyyət naziri **Əbülfəs Qarayev** Azərbaycan aşıq sənətinin inkişafı, təbliği və tədrisi ilə bağlı son illərdə həyata keçirilən fəaliyyətdən söz açdı. Bildirdi ki, ölkəmizin bütün bölgələrində yerləşən musiqi məktəblərində saz sənəti proqrama daxil edilərək öyrədilir, tədris olunur. Bütün bunlar qədim xalq sənətinin gələcək nəsillər tərəfindən qorunmasına, yaşadılmasına hesablanmış addımdır.

Nazir əbədi mənəvi varlığımız olan aşıq sənətinə ulu öndər Heydər Əliyevin yüksək qiymət verdiyini, ümummilli liderin təşəbbüsü ilə 2000-ci ildə UNESCO tərəfindən



"Kitabi-Dədə Qorqud"un 1300 illik yubileyinin keçirildiyini xatırlatdı. Qeyd etdi ki, ulu öndərin dövlətçilik xəttinin layiqincə davam etdirən ölkə başçısı İlham Əliyev ədəbiyyatımıza, incəsənətimizə, aşıq sənətinə daim qayğı göstərir, aşıqlarımıza fəxri adlar, Prezident təqaüdü verilir: "Aşıq sənəti xalqımızın mədəni, mənəvi həyatı, dünyagörüşü, yaşayış tərzi ilə vəhdət təşkil edərək daim inkişaf edən bir xalq sənətidir. Xalqımızın digər irs nümunələri kimi, saz-söz sənətimizə də dövlət qayğısı sayəsində bu sənət inkişaf etdirilir və dünya səviyyəsində təbliğ olunur. Dövlət başçısının bu sahəyə diqqəti, Birinci vitse-prezident Mehriban xanım Əliyevanın şəxsi səyi nəticəsində aşıq sənəti bu gün UNESCO-nun Qeyri-maddi mədəni irs siyahısında yer alıb".

Nazir qurultayın işinə uğurlar arzu edərək, aşıq sənətinin bundan sonra da Azərbaycan mədəniyyətinin, musiqisinin inkişafına təkan verəcəyinə ümid etdiyini bildirdi.



Daha sonra Azərbaycan Aşıqlar Birliyinin sədri, Əməkdar elm xadimi **Məhərrəm Qasımlı** çıxış edərək rəhbərlik etdiyi qurumun son illər gördüyü işlərdən danışdı. Vurğuladı ki, son illər ölkəmizdə aşıq sənətinin qorunması, gələcək nəsillərə ötürülməsi, araşdırılması, inkişaf etdirilməsi, gənclərin bu sənətə istiqamətləndirilməsi yönündə mühüm işlər görülür. Sözsüz ki, bu işlərin ardıcıl və sistemli şəkildə aparılmasında Azərbaycan Aşıqlar Birliyinin üzərinə böyük məsuliyyət düşür.

Natiq dedi ki, bu gün milli-mənəvi dəyərlərimizə, o cümlədən də aşıq sənəti ilə bağlı olan tarixi dəyərlərimizə ölkəmizdə böyük həssaslıqla yanaşılır və dövlət qayğısı göstərilir. 2009-cu ildə aşıq sənəti Azərbaycan xalqına məxsus bir inci kimi dünya sənət şedevrləri sırasında – UNESCO-nun Qeyri-maddi mədəni irs üzrə reprezentativ siyahısına daxil edildi. Bildirdi ki, bu gün aşıq sənəti bir dövlətçilik atributu kimi diqqət mərkəzindədir. Bu sənət dövlətçiliyə bağlı olan sənətdir.

Türkiyədən gəlmiş folklorşünas **Əli Kafkasyalı**, Bəstəkarlar İttifaqının sədri, Xalq artisti **Firəngiz Əlizadə**, professor **Qəzənfər Paşayev**, aşıqlar **Mahmud Məmmədov, Ulduz Quliyeva, Samirə Əliyeva** və digər çıxış edənlər qurultayın əhəmiyyətindən söz açdılar, aşıq sənətinin humanitar mədəniyyət strategiyasındakı rolunu vurğuladılar.

Əməkdar mədəniyyət işçisi **Əhliman Rəhimov** Azərbaycan Aşıqlar Birliyi Nəzarət-təftiş komissiyasının hesabatını təqdim etdi.

Birliyin katibi, Əməkdar Mədəniyyət işçisi **Musa Nəbioğlu** Azərbaycan Aşıqlar Birliyinin Nizamnaməsinə edilən dəyişikliklər haqqında qurultay iştirakçılarına məlumat verdi. Nəzərdə tutlan dəyişikliklər – Birliyin Qurultayının bundan sonra 5 (beş) ildə bir dəfə keçirilməsi və İdarə heyəti üzvlərinin sayının 25-dən 31-ə qaldırılması yekdilliklə qəbul olundu.

Sonra qurultayda təşkilati məsələlərə baxıldı. Səsvermə nəticəsində Əməkdar elm xadimi, professor Məhərrəm Qasımlı Azərbaycan Aşıqlar Birliyinin sədri, **Musa Nəbioğlu, Altay Məmmədli** və **Ağamurad İsrafilov** katiblər seçildilər.

Sonda qurultay iştirakçılarının Prezident **İlham Əliyevə** təşəkkür müraciəti oxundu. Qurultayın adından Qətnamə qəbul olundu.

## AZƏRBAYCAN AŞIQLARININ V QURULTAYININ PREZİDENT İLHAM ƏLİYEVƏ MÜRACİƏTİ

**Hörmətli Prezidentimiz İlham Əliyev cənabları!**

Müstəqil Azərbaycan dövlətinin qurucusu ümummilli liderimiz Heydər Əliyevin ləyaqətli siyasi varisi kimi ölkəmizin iqtisadi və sosial-mənəvi həyatının inkişafı istiqamətində həyata keçirdiyiniz genişmiqyaslı fəaliyyəti həm bütövlükdə xalqımız, həm də biz saz-söz sənətkarları ürəkdən bəyənirik. Bu gün Azərbaycanda gedən iqtisadi və mədəni quruculuq işləri yaxın gələcəkdə nail olacağımız yüksək inkişafın uğurlu özülüdür. Mədəniyyətimizin digər sahələri kimi musiqi mədəniyyətimiz, xüsusən də muğam və aşıq sənətlərinin inkişaf perspektivləri ilə bağlı həyata keçirdiyiniz sistemli tədbirlərə görə Sizə dərin təşəkkürümüzü bildiririk. Muğam sənətinin UNESCO-nun qeyri-maddi irs siyahısına salınmasından sonra dövlətimizin əvəzsiz milli sərvətimiz olan aşıq sənətinin də həmin siyahıya daxil edilməsi barədəki təşəbbüsü Sizin milli-mənəvi varlığımıza böyük diqqət və məhəbbətinizdən xəbər verir.

Qurultayımızın yüksək səviyyədə keçirilməsinə yaratdığınız şərait və sənətimizə verdiyiniz dəyər sizə olan sevgi və ehtiramımızı daha da artırır. Aşıq sənətinə dövlət səviyyəsində qayğının hər birimizin sənət və məişət həyatında öz əksini tapacağına inamımız böyükdür. Ümidvarıq ki, Dədə Qorqud yadigarı olan bu qədim və möhtəşəm sənətin qorunması, inkişafı və təbliği daim diqqət mərkəzində olacaqdır.

Aşıqlarımız tarixən olduğu kimi, bu gün də dövlətçiliyimizin, müstəqilliyimizin, vətən torpaqlarının birlik və bütövlüyünün tərənnümçüsü və

mənəvi keşikçiləridir. Biz Heydər Əliyev ideyalarının təbliğini, Heydər Əliyev şəxsiyyətinin uğurlarını sazımız və sözümüzlə dünyaya yaymaqdan qürur duyuruq. Xalqımızın qəhrəmanlıq, vətənpərvərlik, milli dövlətçilik ruhunun yüksəldilməsində, torpaqlarımızın birliyi, bütövlüyü uğrunda mübarizədə sinəmizdəki Koroğlu sazı susmaq bilmədən öz müqəddəs tarixi missiyasını şərəflə davam etdirəcəkdir.

**Hörmətlə,**
**Azərbaycan Aşıqlarının V qurultayının nümayəndələri**
**29 avqust 2008-ci il.**

## AZƏRBAYCAN AŞIQLARININ VI QURULTAYININ QƏTNAMƏSİ

Xalq yaradıcılığının ən zəngin və qüdrətli qollarından sayılan aşıq sənətinin ənənələrini, çağdaş durumunu və perspektivlərini dərindən araşdıran Azərbaycan Aşıqlarının VI Qurultayı mədəni həyatımızda baş verən uğurlu hadisələrdən biri olaraq öz işini yekunlaşdırır. Azərbaycan Aşıqlarının VI Qurultayı məruzə və çıxışlara, müzakirələr zamanı müxtəlif məsələlərlə bağlı səsləndirilmiş təkliflərə əsasən qərara alır:

1. Milli mədəniyyətin, tarixi-mənəvi dəyərlərin qorunması və inkişaf etdirilməsi istiqamətində müstəqil Azərbaycan dövlətinin yeritdiyi mədəni siyasət bəyənilsin. Ümummilli liderimiz Heydər Əliyevin müəyyənləşdirdiyi milli mədəniyyət strategiyasının uğurla həyata keçirilməsində Prezident İlham Əliyevin genişmiqyaslı fəaliyyəti yüksək dəyərləndirilsin. Milli-mənəvi dəyərlərə qayğı və diqqətin yüksəldilməsi sahəsində Azərbaycan Respublikasının birinci vitse-prezidenti, Heydər Əliyev Fondunun prezidenti Mehriban xanım Əliyevanın səmərəli fəaliyyətinin nəticəsi kimi 2009-cu ildə aşıq sənətinin UNESCO-nun qeyri-maddi mədəni irs üzrə reprezentativ siyahısına salınmasının bu sənətin tarixində mühüm hadisə olduğu qeyd edilsin.
2. Milli mədəniyyəti təmsil edən digər sahələr kimi, aşıq sənətinin qorunması, təbliğı və inkişafı ilə bağlı Mədəniyyət Nazirliyinin dəyərli fəaliyyəti qədirşünaslıqla qeyd edilsin.
3. Azərbaycan xalqının mənəvi qüdrətini təmsil edən unikal bir mədəniyyət hadisəsi kimi aşıq sənətinin beynəlxalq miqyasda məqsədyönlü şəkildə təbliği istiqamətində fəaliyyət genişləndirilsin, bu sahədə sistemli və ardıcıl iş aparılsın.

4. Aşıq sənətinin tədrisi işinin keyfiyyətcə yeniləşdirilməsinə xüsusi diqqət yetirilsin. Tədris proqramları təkmilləşdirilsin, günün tələblərinə cavab verən dərsliklər hazırlansın. Ustad aşıqların, istedadlı saz ifaçılarının tədris prosesinə cəlb olunması ilə bağlı tədbirlər görülsün. Mədəniyyət və İncəsənət Universitetinin bu sahədəki fəaliyyəti təqdir olunsun.

5. Aşıqların sosial statusu və maddi vəziyyətinin yaxşılaşdırılması ilə bağlı dövlət qayğısı gücləndirilsin. Onların iş yerləri ilə təmin olunması, adlı təqaüdlərə, fəxri adlara təqdim edilməsi daim diqqət mərkəzində saxlanılsın.

6. Vahid, müstəqil yaradıcılıq mərkəzi statusunda "Ozan-Aşıq Evi"nin yaradılması təklifinin əlaqədar dövlət qurumları tərəfindən himayə olunması üçün ardıcıl iş aparılsın.

7. Gədəbəy rayonunda "Aşıq Musiqi Məktəbi"nin açılması təqdir olunsun və bu sahədə fəaliyyət genişləndirilərək bu sənətin daha geniş yayıldığı Qazax, Tovuz, Akstafa, Gəncə, Şamaxı və digər rayonlarda da müvafiq məktəblərin tikilməsinə nail olunsun.

8. Dastanlarımızın dövrün tələblərinə uyğun şəkildə yeni təqdimatda ifa olunub sənətsevərlərə çatdırılması üçün "Dastan teatrı" yaradılsın.

9. Aşıq sənətinin genişmiqyaslı və dolğun tarixi-mədəni mənzərəsini əks etdirən "Ozan-aşıq ensiklopediyası"nın nəşri həyata keçirilsin, xalqımızın qəhrəmanlıq tarixini özündə əks etdirən "Koroğlu ensiklopediyası" hazırlansın. Aşıq sənətinə dair dövri nəşrlərə və ustad aşıqların həyat və fəaliyyətlərinə həsr olumuş kitabların nəşrinə diqqət artırılsın.

10. Kütləvi informasiya vasitələrində ustad aşıqların, saz-söz sənətinin, milli epos mədəniyyətinin işıqlandırılmasına diqqət artırılsın. Aşıq yaradıcılığı ilə bağlı kino və telefilmlərin, radio-televiziya verilişlərinin hazırlanması işi keyfiyyətcə yeniləşdirilsin. Klassik və müasir ifaçıların, saz havalarının audio və videolentlərə yazılması, müasir tələblərə cavab verən audio və video albomların hazırlanması, onların ölkə daxilində və beynəlxalq miqyasda təbliği sistemli şəkildə həyata keçirilsin. Bu sahədə Azərbaycan TV və Mədəniyyət kanalının, İctimai TV-nin fəaliyyəti bəyənilsin. "Dünya", "Lider", "Speys" TV-lərdəki aşağı səviyyəli bayağı saz verilişlərinin ictimaiyyətin narazılağına səbəb olduğu qeyd edilsin.

11. Artıq Azərbaycanda iki dəfə uğurla baş tutmuş Beynəlxalq aşıq festivalı müntəzəm və davamlı şəkildə keçirilsin. Gənc istedadları üzə çıxarmaq üçün iki ildən bir "Aşıq müsabiqəsi" keçirilsin.

***DƏDƏ ŞƏMŞİR - 125***



**Zəlimxan YAQUB**
**Xalq şairi**

# ŞƏMŞİRLİ, ŞƏMŞİRSİZ GÜNLƏRİM MƏNİM

Tez-tez yuxularda görürəm səni. Tez-tez həyatda qarşılaşırıq səninlə. Evimdə, elimdə, dilimdə, məclislərdə, səfərlərdə, toylarda, yaslarda anıram səni. Oxuduğum nəğmədə, dediyim bayatıda, bağrıma basdığım sazda, çaldığım havalarda həmişə sən varsan, Dədə Şəmşir! Düz on il ağsaqqal-cavan, ustad-şagird, ata-oğul kimi bir-birimizə bağlı yaşadıq. Məni öz doğma balalarından seçmədin, oğlun-övladın kimi sevdin, əzizlədin, Dədə Şəmşir! Məni necə əzizlədiyini mənim haqqımda yazdığın şeirlər, mənə göndərdiyin məktublar danışır, ustad! Səni necə sevdiyimi qoy haqqında yazdığım şeirlər, nəğmələr silsiləsi, deyişmələr çələngi desin, dastanlaşmış görüşlər, hadisələr söyləsin, el ağsaqqalı! Səni ilk dəfə həyatda gördüyüm zamandan çox-çox əvvəl – Borçalı məclislərində, ustad aşıqlarımızın, Əmrahın, Kamandarın, Hüseyn Saraçlının sözündə, söhbətində, əfsanələşmiş ”Vurğun – Şəmşir” dastanında gözümlə görüb, qulağımla eşidib, qəlbimlə duymuşam. Kövrək uşaqlığım, zərif körpəliyim yazdığın şeirlərin ətrinə bələnib, ozan babam! Uşaq marağım, körpə məhəbbətim, təmiz niyyətim sənin görüşlərinə doğru aparırdı məni. “Niyyətin hara, mənzilin ora”, – deyiblər. İllərlə gözlədiyim belə bir gün gəlib çatdı. Bakıda Aktyor evində 80 yaşını qeyd etmək üçün hazırlıq işləri gedirdi. Günlərin bir günündə yaxşılıqlarını heç vaxt unutmadığım, neçə-neçə qayğısını gördüyüm unudulmaz xalq şairimiz Osman Sarıvəlli Yazıçılar İttifaqında məni görüb, öz iş otağına dəvət elədi. Özünəməxsus qayğı və səmimiyyətlə – hazırlaş, Aşıq Şəmşirin 80 illiyində gənc şairlər adından sənə söz verəcəyəm! – dedi. Ustad şairə minnətdarlığımı bildirib, otaqdan necə çıxdığımı bilmədim. Sevincimdən yerə-göyə sığmırdım. Uçmağa bircə qanadım çatmırdı. Bu şad xəbər məni universitetə, tələbə yataqxanasına doğru yel kimi uçururdu.

Dillər əzbəri olan şeirlərinin birində belə demişdin, Dədə Şəmşir:

*Şəmşiri axtarıb görmək istəsən,*
*Verdiyin ilqara gəl vədəsində!*

Mən də bu poetik tapşırığa əməl edib, xalqımız sənin ad gününü bayram elədiyi bir vaxtda sənin görüşünə, ziyarətinə gəlmişdim.



O məclis indiyə qədər gördüyüm məclislərin, bəlkə də, ən gözəli, ən şiriniydi. Məclisə kimlər gəlməmişdi: Mirzə İbrahimov, Süleyman Rəhimov, Əli Vəliyev, Nəbi Xəzri, Hüseyn Arif, Balaş Azəroğlu və adını çəkmək, sadalamaq imkan xaricində olan nə qədər yazıçı, şair, sənət adamı, saz-söz vurğunu, sənət fədaisi. Yubiley məclisinə Osman Sarıvəlli ağsaqqallıq edirdi. "Səməd Vurğun – Aşıq Şəmşir" söhbəti məclisin cazibə qüvvəsinə çevrilmişdi. Səməd Vurğun cismən o məclisdə iştirak etməsə də, mənən bütün çıxışların qəhrəmanına çevrilmişdi. Böyük şairin ömründən böyük aşığın ömrünə düşən qayğılar ən şirin nağıllar kimi danışılır, ən gözəl xatirə kitabı kimi varaqlanırdı. Bu tarixi görüşün yaşca ən kiçik nümayəndəsi kimi söz demək şərəfi mənə də çatdı. Daxilən çox çılğın və həyəcanlı olsam da, sözümü, fikrimi xalqa çatdıra bildim. Gur alqışlar içində səni bağrıma basdım. Ata-oğul kimi qucaqlaşdıq. O gecə oxuduğum şeirlərdən birini yenidən xatırlamaq yerinə düşər. Ruhun şad olsun, ozanlar ozanı!

*Aşıq el oğludu, el anasıdı,*
*Qəlbindən fərəhlə, qəm şirə çəkər.*
*Bağban da özüdü, bağ da özüdü,*
*Həm çiçək bitirər, həm şirə çəkər.*

*"Yanıq Kərəmi"ni gətirsən dilə,*
*Əriyər odunda dağ gilə-gilə.*
*İncə barmaqların dad verər zilə,*
*Usta əllərindən bəm şirə çəkər.*

*Zəlimxan yollarda min köhlən yora,*
*Qəlbi düşən deyil heç zaman tora.*
*Çəkməz nanəcibə, çəkməz nankora,*
*Çəksə Ələsgərə, Şəmşirə çəkər.*

Məni Ələsgərə, Şəmşirə çəkən duyğular zirvə qarının təmizliyindən, dağ çeşməsinin saflığından, Göyçənin köklü-budaqlı, sazlı-sözlü torpağından, Dəlidağdan, Ceyran bulağından mayalandı, ömürlük yol yoldaşıma, könül sirdaşıma çevrildi, həmin tarixi gecəni həmişəlik yaddaşıma yazdı. O gecədə el ağsaqqalı, şair dostum Şamil Əsgərin həyəcanlı çıxışı heç vaxt yadımdan çıxmaz. Şamil müəllim böyük səxavət və məhəbbət hissiylə bütün yubiley

iştirakçılarını Kəlbəcərə – aşığın saz-söz bayramına dəvət edirdi. İndi Şamil müəllimi Bakının küçələrində, xeyir-şər məclislərində görəndə ürəyim göynəyir, qəlbim sızıldayır. Onun Kəlbəcərdəki evi Azərbaycan mədəniyyətinin, tarixinin, poeziyasının beşiyi idi. Rəhbərlik etdiyi Kəlbəcər diyarşünaslıq muzeyi dünyanın əvəzsiz incisi idi. Çox-çox təəssüflər olsun ki, Allah vergisi olan sərvətlərimizi biganəliyimizə qurban verdik. Nə isə... qayıdaq mətləbə.

Aradan illər keçdi. 1979-cu ildə Aşıq Şəmşirin anadan olmasının 85 illiyi Kəlbəcərdə qeyd edilirdi. Rayon Mədəniyyət evində ayaq basmağa yer yox idi. Burda keçirilən yubiley gecəsi sözün həqiqi mənasında mənəvi zirvə sayılan bir tədbir idi. İndiki millət vəkili, o zaman Kəlbəcər rayon partiya komitəsinin birinci katibi işləyən, yaxın dostum İnqilab Nadirov çox böyük təşkilatçılıq işi görmüş, bütün rayonlardan qonaqlar dəvət eləmişdi. Tədbirə Bakıdan – Yazıçılar İttifaqından, müxtəlif təşkilatlardan xeyli adam gəlmişdi. Aşıq Şəmşir sənətinin dostları – Məmməd Aslan, Hüseyn Kürdoğlu, Nüsrət Kəsəmənli, Famil Mehdi, Fikrət Sadıq, Səyavuş Sərxanlı və başqaları öz yaddaqalan çıxışları ilə o məclisi tarixə çevirib yaddaşlara yazdılar. El şairi Əli Qurbanovun odlu-alovlu çıxışı indi də qulaqlarımda səslənir. Kəlbəcər aşıqlarının bir-birindən gözəl çıxışları qocaman aşığın həmişəcavan duyğularını bütün Azərbaycana çiçək kimi səpmək istəyirdi. Aşıq Şəmşirin çıxışı, söhbəti Səməd Vurğunun valdan eşidilən dağ çayı kimi ləngərli, axar-baxarlı səsinə qarışıb sehrli və doyumsuz bir mənzərə yaratdı. Kəlbəcər ömrünün ən xoş günlərini yaşayırdı. Mübaliğəsiz deyə bilərəm ki, mənim ömrümün də ən gözəl çağlarının bir hissəsi o vaxtdan sonra Kəlbəcərlə bağlandı.

Dəfələrlə ilahi gözəlliklərin – çayların, çeşmələrin, İstisuyun, Dəlidağın, Başlıbelin, Taxtadüzün, Tərtərin, Ağdabanın eşqi ilə səfərə çıxdım, ziyarətə getdim. Bütün bu ziyarətlər Dədə Şəmşirlə, Güllü nənə ilə, Qəmbər müəllimlə, Ələsgərlə, Rəşidlə, Ağdabanlı Aşıq Qurban ocağının dünəni və bu günü, gələcək taleyi ilə bağlı olurdu. Dədə Şəmşirin sonbeşik oğlu Rəşidin toyunda Ağdabanda keçirdiyimiz günlər, görüşdüyümüz sənətkarlar bir dastanlıq sözün-söhbətin mövzusudur. Hər görüşdə, hər söhbətdə Aşıq Şəmşirin şair və aşıq, ustad və ozan ömrünün yeni bir hikməti açılır, təzə bir çaları üzə çıxırdı. "Ustad görməyənin işi xam qaldı" deyiminin nə qədər ilahi bir gücə qadir olduğunu ustadı hər dəfə yenidən kəşf edəndə daha geniş anlamda başa düşürdüm. Heç bir kitabda oxumadığım, heç kəsdən eşitmədiyim Allah kəlamları, ustad deyimləri, dinimizin və dilimizin qüdrətiylə bağlı xoruz səsi eşitməyən mətləblər vardı Dədə Şəmşirdə. Bizim biganəliyimizin ucbatından hamısını özü ilə apardı.

Kəlbəcər və Şəmşir sözləri mənim üçün suyla torpaq kimi, közlə ocaq kimi, sözlə dodaq kimi bir-birinə yaxın və doğma sözlərdir. Çünki Allah-Təala Kəlbəcəri xəlq edəndən bu günə kimi Kəlbəcər heç bir aşığın, şairin, ziyalının dilində Aşıq Şəmşirin dilində olan qədər poetik yüksəkliyə, mənəvi ucalığa qalxıb, poeziyanın mənəvi sərvətinə çevrilməyib.

*Qartal düşüncəli, şair xəyallı,*
*Tərlan yuva salan dağlar oğluyam.*
*Anam İstisudu, atam Dəlidağ,*
*Uçurumlu sərt qayalar oğluyam.*

Dəlidağa ata, İstisuya ana deyən, tərlan yuvasını özünə dünya bilən ustad sənətkarımızla hər görüş, hər ayrılıq neçə-neçə şeirin, əsərin yaranmasına səbəb olurdu. Ustadın görüşünə gedəndə ürəyimdən bu misralar keçirdi:

*Təbiətin ürəyindən od aldı,*
*Həm Fərhadı, həm Şirini dağların.*
*Sinəsində enər-qalxar avazlar,*
*Zil şöhrəti, bəm şirini dağların.*

*Bulağı var, gözlərimdə dənizdi,*
*Çiçəyi var, bir solmayan bənizdi.*
*Mənə iki gözüm qədər əzizdi,*
*Həm acısı, həm şirini dağların.*

*Nə yorular, nə bu yoldan bezərəm,*
*Ömrü-günü nəğmələrlə bəzərəm.*
*Ana yurdu Vurğun deyib gəzərəm,*
*Unutmaram Şəmşirini dağların.*

Ustad məni Kəlbəcərə elə həvəslə çağırırdı ki, bu çağırışlar, görüşlər necə şeirə, şeriyyətə çevrilməsin:

*Şair oğlum, Kəlbəcərə qonaq gəl,*
*Qədəmlərin gül üstündə yerisin.*

Bir görüşün bir dastana sığışmayan sözündən-söhbətindən sonra Dədə Şəmşirin sazını bağrıma basıb ustadla belə vidalaşırdım:

*Kəlbəcər dağları, salamat qalın,*
*Meylimi düzlərə salıb gedirəm.*
*Zirvələr önündə əyib başımı,*
*Dərin bir xəyala dalıb gedirəm.*

*Dünya yarıtmadı məni payından,*
*Nə ilindən doydum, nə də ayından.*
*Ceyran bulağından, Tərtər çayından,*
*Vurğunun ətrini alıb gedirəm.*

*Zəlimxan, alışıb yanmaqdır peşəm,*
*Gərək Fərhad olub qayalar deşəm.*
*Qurban ocağında közə dönmüşəm,*
*Şəmşirin sazını çalıb gedirəm!*

Mən “gedirəm” deyəndə, ustad “getmə!” – deyirdi. Duyğularım o qədər qanadlı, hisslərim o qədər duru olurdu ki, kişinin ağzından çıxan hər söz, hər

kəlmə mənim təzə bir şeirimin yaranmasına səbəb olurdu. Yaxşı yadımdadır, o, "getmə" deyəndə "Qaytarma" üstündə mən bu sözləri oxuyurdum:

*Su içmişəm bulağından dağların,*
*Bulaq olub süzülməmiş getmərəm.*
*Yazın xeyli həsrətini çəkmişəm,*
*İntizardan üzülməmiş getmərəm.*

*Vurulmuşam şimşəklərin oynuna,*
*Sığınmışam çəmənlərin qoynuna.*
*Misralarım çiçəklərin boynuna,*
*Muncuq kimi düzülməmiş getmərəm.*

*Gözüm qalıb naxışında, zehində,*
*Daranmışam küləyində, mehində.*
*Qoy islanım yağışında, şehində,*
*Dolusunda əzilməmiş getmərəm.*

*Aran anam, yaylaq bacım, dağ atam,*
*Gərək hər gün qanad açam, tağ atam.*
*Şeirim olub düzə ləzzət, dağa tam,*
*Bu yerlərə yazılmamış getmərəm!*

Kəlbəcərdən ayrılsam da, cığırlarda izim, qayalarda səsim qalırdı. Kəlbəcər xatirəli, Şəmşir qanadlı duyğularla Borçalıya uçur, Bakıya qayıdırdım. Aşıqlığı, şairliyi, ağsaqqallığı qədər ürəyi də böyük idi Dədə Şəmşirin. Təkcə məni yox, bütün Azərbaycan şairlərini, ustad aşıqlarımızı, görkəmli ziyalılarımızı Kəlbəcərdə Kəlbəcərin özü qədər böyük sevgi və səxavətlə qarşılayardı böyük ustadımız. Bu sevgi və səxavət göydən düşməmişdi, onun kökündən, soyundan, nəsil şəcərəsindən gəlirdi. Rəhmətlik həmişə deyərdi ki, insan bucaqda yox, ocaqda böyüyər, külü küllükdən götürərlər. Şah İsmayıl Xətaidən, Miskin Abdaldan, Ağdabanlı Aşıq Qurbandan Şəmşirə qədər gələn bu köklər-budaqlar Azərbaycan mənəviyyatının dərin qatlarından xəbər verir. Allah Kəlbəcəri Şəmşirə, Şəmşiri də Kəlbəcərə xəncərə gümüş kimi yaraşdırmışdı.

Təəssüflər olsun ki, uzun illər ötəri-itəri vıyıltılara baş vermişik, sənətin özəyi, cövhəri, mahiyyəti ilə yox, bəzəyi, parıltısı ilə məşğul olmuşuq. Neçə-neçə görkəmli sənətkarımızın yaradıcılığı və şəxsiyyəti elmi və bədii nöqteyi-nəzərdən arzu olunan səviyyədə araşdırılmayıb, öyrənilməyib. Bu da bizə çox-çox baha başa gəlib. Tale Kəlbəcərli, Şəmşirli günləri bizə çox gördü. Əvvəlcə Şəmşirsiz qaldıq, sonra Kəlbəcərsiz! Dilim qurusun Allah, Allah! Kəlbəcərsiz də Azərbaycan olarmı? Aşıq Şəmşirin yanına üzüqara getməmək üçün igidlərin, şəhidlərin qanı bahasına olsa da, bütün Azərbaycan torpağı, o cümlədən Kəlbəcər əvvəlki günlərinə və əvvəlkindən də yaxşı vəziyyətə qayıtmalıdır! Bunu bizdən düşmən tapdağı altında inləyən, əzab çəkən Ələsgərin, Vaqifin, Natəvanın, Sarı aşığın, Şəmşirin müqəddəs ruhları tələb edir.

Ömrünün son illərində tez-tez xəstələnərdi. Bir neçə dəfə müalicəsi ilə bağlı Bakıya, Mərdəkana gəldi. Bu gəlişlərin hamısında onunla olmağa can atar, ustadı darıxmağa qoymazdım. Hər görüşdə onu bir şəxsiyyət kimi yenidən kəşf edərdim. Ağrısını büruzə verməz, şeirdən, sənətdən şirin söhbətlər açar, kövrək xatirələrə baş vurar, Ələsgərin, Vurğunun adı dilindən düşməzdi. Uşaqlığında Ələsgəri, cavanlığında Vurğunu görən Dədə Şəmşir Ələsgərə "Ələsgər əmi", Səməd Vurğuna "Səməd" deyərdi. Xalqın yaddaşında dastanlara çevrilən söhbətləri kitab kimi yenidən varaqlayardı. Möcüzəli yaddaşı vardı. Yaşı doxsanı haqlasa da, şeir oxuyanda qətiyyən çaşmazdı. Günlərin birində Dədə Şəmşirdən xahiş elədim ki, Səməd Vurğunlu günlərindən söhbət elə. Ustad cavabında bildirdi ki, Səməd Vurğunla bağlı xatirələrim hamıya məlumdu. Məndən Səməd Vurğunsuz günlərimin xatirəsini soruş. Xeyli fikrə getdi. Qaşları çatıldı, bir azdan dodağına nurlu bir təbəssüm gəldi. Fikirli-fikirli dedi: Səmədi Allah əlimizdən çox tez aldı. Onun ölümü bir çox el sənətkarlarının mənəvi ölümünə səbəb oldu. Qəlbinin telləri saz üstündə köklənmiş şairlərin, aşıqların çoxunu yetim qoydu Səməd. Səməd Vurğundan böyük qayğı və məhəbbət görən el adamlarının çoxu sonralar adını şair qoyub. Böyük vəzifə və imkan sahibi olan adamlardan soyuq və ögey münasibət görüb həyatdan və yaradıcılıqdan küsdülər.

Bu da bizə, şəxsən mənə çox ağır təsir elədi. Yaxşı ki, Səməd Vurğunun mənimlə bağlı vəsiyyətini Osman Sarıvəlli yüksək ləyaqətlə yerinə yetirdi.

Mənim kitabımı çap etdirmək istəyən Səməd Vurğunun arzusunu Osman Sarıvəlli öz öhdəsinə götürdü və bu işin öhdəsindən gəldi. Səməd Vurğunsuz günlərimdə çox əziyyətlər, biganəliklər gördüm, danışsam çox gedər, bu mövzuda başqa şeirlərimlə yanaşı, bir təcnis də yazmışam:

*Kim küsər oldusa halal payından,*
*Əlinə nə əppək, nə kökə düşdü.*
*Artıq tamah ayrı düşdü tayından,*
*Çöpü nə arığa, nə kökə düşdü.*

*Neyləyirəm, ürək olsa bir dəmir,*
*Qoca aşiq ləblərini birdəmir.*
*Taleyin kotanı kəskin bir dəmir,*
*Nə daşa ilişdi, nə kökə düşdü.*

*Qızıl gülü bağçamızdan üz, a çıx,*
*Aç pərdəni, gəl məclisə üz açıq.*
*Yatan baxtım, cavanlığım, üzə çıx,*
*Gör Şəmşir qocaldı, nə kökə düşdü.*

Azərbaycan aşıq şeirinin çox nadir qafiyəsi üstündə yazılan bu təcnis məni çox duyğulandırdı. Mən bu mövzuda gedən söhbətlərimizdən çox kövrəldim və ustada belə bir şeir yazdım:

*Sənsiz Kəlbəcərdə darıxmazmı saz,*
*Yatma, bu yastıqdan dur, Dədə Şəmşir.*

*Ellər məclisinə bərəkət kimi,*
*Yağsın sifətindən nur, Dədə Şəmşir.*

*Ömrü uzanmasın həsrətin, qəmin,*
*Vaxtıdı dağlarda söhbətin, dəmin.*
*Gözləri yol çəkir Güllü nənəmin,*
*Yolun damarını qır, Dədə Şəmşir.*

*Gümüşü tellərə çəkilsin sığal,*
*Ruhuma naxışdı hər vurulan xal.*
*Ömrün doxsanında "Qəhrəmanı" çal,*
*Desinlər eşqinə kür, Dədə Şəmşir.*

*Gəl qoyma cavabsız sual-sorğunu,*
*Etmə Zəlimxanı illər yorğunu.*
*Ceyran bulağından soruş Vurğunu,*
*Məclisi təzədən qur, Dədə Şəmşir.*

Şeir rəhmətliyin çox xoşuna gəldi. Növbəti görüşlərimizin birində həmin şeirə yazdığı cavabı oxudu:

*Dürlü sözün nələr saldı yadıma,*
*Düşdü xəyalıma hara, Zəlimxan.*
*Ata övladına həsrət qaldımı,*
*Sənətkarı axtar, ara, Zəlimxan.*

*Sığallı tellərə nə lazım sığal,*
*Fəhmimdə fərasət, başımda kamal.*
*Bir "Cəngi" oxuyum, eşit ləzzət al,*
*Səs yayılsın o dağlara, Zəlimxan.*

*Əlimdən gedibdi həya, ismətim,*
*Hələ müşkül haldı sözüm-söhbətim.*
*Taleyim yar olsa, olar qismətim,*
*Yönüm düşər o dağlara, Zəlimxan.*

*Aşiqə müqəddəs yol budu, dostum,*
*Bizə ilham verən el budu, dostum,*
*Qurbanın saldığı yol budu, dostum,*
*Rəhmət böyük sənətkara, Zəlimxan.*

*Fikir ver Şəmşirin çəkdiyi aha,*
*Söz ağır gəlməsin qadir Allaha.*
*Vurğunu çağırmaq çətindir daha,*
*Qövr edir sinəmdə yara, Zəlimxan.*

105 il yaşayan Aşıq Ələsgərin, 100 ildən çox yaşayan Ağdabanlı Aşıq Qurbanın davamçısı, yadigarı, övladı olan Aşıq Şəmşir 100 ili başa vura bilmədi. Dünyadan

vaxtsız gedən Əkbər adlı oğlunun, Səməd Vurğun kimi böyük dostunun dərdi yaşamağa aman vermədi. Ömrünün 87-ci ilində ölüm onu yaxaladı. Ölümündən bir neçə gün əvvəl yazdığı şeirlərdə yenə bizi – dostlarını xatırlamışdı:

*Bu müşkül halımda mənəm deyənlər,*
*Borandadı gəlsin, qardadı gəlsin.*
*Fani dünya Süleymana qalmayıb,*
*Əli xəzinədə, vardadı gəlsin.*

*Mənim bu dərdimə münasib dərman,*
*İstəkli dostlardı, sevdiyim insan.*
*Hüseyn Kürdoğlu, oğlum Zəlimxan,*
*Səyavuş Sərxanlı hardadı, gəlsin.*

*Dərsim aldım, kama çatdım "əmmə"də,*
*Var canımda bir amansız əmmə də.*
*Xəbər verin Kəlbəcərli Məmmədə,*
*Şəmşir dərdə düşüb, dardadı, gəlsin!*

Ustadın çağırışına dostları və bütün Azərbaycanın şeirsevər ziyalıları səs verib özlərini Kəlbəcərə yetirdilər. Ancaq gec idi, biz ustadın son nəfəsinə yetişə bilməmişdik. Başını qaldırıb son dəfə dünyaya boylanan sənət övladı ölüm ayağında belə "özünü itirməmiş", "Salamat qalın" rədifli məşhur qoşmasında ürək dostlarının, könül adamlarının adını hörmətlə yada salmış, eli-obası, yurdu-yuvası, işıqlı dünyası ilə halal bir nəfəslə halallaşmışdı.

Ağdaban kəndinin qənşərində yan-yana dayanmış "Yeddi qardaş" dağı var. Yeddisi də bir-birindən öyməli, boylu-buxunlu. Yeddinci dağın zirvəsində bir uşaq qəbiristanlığı var. Dədə Şəmşirin vəsiyyətinə görə biz onu həmin uşaq qəbiristanlığına, yeddinci dağın zirvəsinə tapşırdıq. Fikri, xəyalı həmişə zirvələrdə dolaşan bir ustadın məzarı da zirvələrə qismət oldu. Torpağın şöhrətinə, elin-obanın səcdəgahına çevrildi. Allahın işinə baxın ki, Dədə Şəmşirin dəfn günündə qar dizə çıxsa da, günəş bütün varlığını Kəlbəcərə həsr eləmişdi. Yerin nuru, göyün nuru bir-birinə qarışıb ustadı Haqq evinə gur işıqlar içində yola salırdı. O gün Kəlbəcərin ən işıqlı günü idi. Dədə Şəmşirin poeziyası kimi! O gün Kəlbəcərin ən qaynar günü idi. Dədə Şəmşirin məclisləri kimi!

Kəlbəcər faciəsi ilə bağlı məni ən çox yandıran ustadın əlyazmalarının külə-kömürə çevrilməsi oldu. Bu gün ustadla bağlı mənim yeganə təsəllim aşığın məndə olan əlyazmaları, məktubları, bir də müxtəlif vaxtlarda birlikdə çəkdirdiyimiz qiymətli şəkilləridi. Əlyazmaların külə dönməsi məni ona görə çox yandırır ki, mən dəqiq bilirdim orda nələr var. Şəmşir kişinin atası Ağdabanlı Qurbanın "Qurani-Kərim"in yazılarına bənzəyən, xəttatlıq nümunəsi səviyyəsində əlyazmalarını da görmüşdüm orda. Aşıq Şəmşir atasının əlyazmalarını özününkülərdən daha artıq bir sevgi və oğul məhəbbətiylə göz bəbəyi kimi qoruyub saxlayırdı. Xəstə Qasım demiş: "Ay hayıf, hayıf" onun qoruduğu xəzinəni biz qoruya bilmədik, min əhsən bizə!

***10.12. 1993***

***Alimin arxivindən***



**Sədnik Paşa PİRSULTANLI**
**professor**

# ŞƏMŞİRİ YARADAN BİR YOL YARATDI....

Aşıq Şəmşirin adını dilimizə gətirdikdə ilk növbədə xəyalımızda onun ulu babası Miskin Abdal, Şah İsmayıl Xətai, Aşıq Ələsgər və atası Aşıq Qurban canlanır. Qarşımızda isə ucadan-uca, əlçatmaz, başıqarlı nəhəng bir dağ dayanır. Bu əzəmətli dağ qürurumuz və iftixarımız olan, XX əsr Azərbaycan poeziyasının hökmdarı Səməd Vurğundur. XVI əsrdə Şah ismayıl Xətai və Miskin Abdal yazılı və şifahi poeziyamızı bir məcrada birləşdirib qovuşdurdular. Bu missiyanı XX əsrdə böyük şairimiz Səməd Vurğun və istedadlı şair-aşığımız Aşıq Şəmşir birlikdə yerinə yetirdilər.

Səməd Vurğunun tarixi xidmətlərindən biri Ağdabanlı Qurbanın xalq akademiyasının qapılarını taybatay bizlərin üzünə açması oldu. Böyük şairimiz Aşıq Şəmşiri kəşf etdi. Aşıq Şəmşirin nurlu zəkası, şair istedadı genişliyi ilə üzə çıxdı. "Qurban bulağı" yenidən çağladı. Qurban ocağının külaltı közü Vurğun nəfəsindən alışdı, alovlandı. Şəmşirin sənət ocağı yenidən şölələndi, hər yana işıq saçdı. Bu işığa dəstə-dəstə pərrvanələr gəldi, o pərvanələrdən biri də mənəm.

"Yeni Daşkəsən" rayon qəzetinin redaktoru idim. 1961-ci il sentyabr ayının əvvəlində bir aylıq məzuniyyət götürüb Kəlbəcərə – Aşıq Şəmşirin görüşünə yollandım. Çatanda sinəmə bir qatar söz gəldi. O günün səhərisi redaksiyaya gəldim. Ona qədər də qəzetin redaktoru və əməkdaşları məni yazılarımdan yaxşı tanıyırdılar. Kəlbəcərə çatanda yazdığım şeiri və "Dağ çiçəkləri" adlı məqaləmi rayon qəzetində nəşr etdirdim.

**Gəlib çatdım gül çağına,**
**Girdim Şəmşirin bağına.**
**Sinəm döndü söz dağına,**
**O içən çeşmədən içdim.**



Həmin qəzetdən bir neçəsini götürüb Çərəkdar kəndinə gəldim ki, oradan Ağdabana getmək asan olsun. Çərəkdar yolunda iki oğlan məndən soruşdu:

– Hara gedirsən?

Mən cavab verdim:

– Ağdabana, Aşıq Şəmşirin görüşünə gedirəm.

Onlardan biri bildirdi ki, yanındakı Aşıq Şəmşirin oğlu Qəmbər müəllimdir. Biz görüşüb tanış olduq və birlikdə Ağdabana yola düşdük.

Aşıq Şəmşirlə ata-bala kimi səmimi görüşdük. Elə bil əzəldən tanış idik. Sonradan ayrılıb, təzədən bir-birinə həsrət adamlar kimi qucaqlaşdıq. O romantik səhnəni, görüşü olduğu kimi xatırlamaq çox çətindir. Aşığın üzündən peyğəmbər nuru yağırdı.

Səhər çay içib, çörək yeyəndən sonra, daha doğrusu, bir süfrə arxasında çörək kəsdikdən sonra tək armud ağacının yanına gəldik. Xalça-xalı salıb üstündə oturduq. Bir tərəfdə samovar, bir tərəfdə də Aşıq Şəmşirin atası Aşıq Qurbandan bizə miras qalmış iki dəftər. Aşıq Şəmşir dəftərlərdəki şeirləri oxuyur, mən isə yazıya alırdım. Hər hansı misra, bənd müəyyən bir tarixi hadisəyə işarə verirdisə, mən onun yurdunu Aşıq Şəmşirdən soruşurdum. Ağdabanlı Qurban “Mənəm, mən” qoşmasının bir beytində deyirdi:

**Qəm-vərəmdən bağrı şan-şan dəlinən,**
**Bala Dağıstanlı Qurban mənəm, mən.**

Mən “Bala Dağıstanlı” ifadəsi ilə əlaqədar olaraq Aşıq Şəmşirlə söhbət etdim. Aşıq Şəmşir bildirdi ki, XVI əsrin böyük sənətkarı Şah İsmayıl Xətainin dostu Miskin Abdal ulu babalarıdır. Mən bildirdim ki, Miskin Abdalın şeirlərinin bir hissəsini Arazın o tayından gəlmiş qoca bir

aşıqdan yazıya almışam. Onun "Dağlar" şeiri Azərbaycan aşıq poeziyasında yaranmış bütün "Dağlar" şeirlərinin anasıdır. Aşıq Şəmşir bildirdi ki, Miskin Abdal bir müddət Dağıstanda bir xanın vəziri olur. Bir gün Dağıstan dağlarını gəzərkən at ötüşməsində Abdalın atı xanın atını keçir. Xan axşam adam göndərir ki, Abdala deyin o atı mənə versin. Miskin Abdal "Bu gün atı istəyən sabah da arvadımı istəyər", – deyərək yığışıb Azərbaycana köç eləyir. Yayın ortasında Miskin Abdal yağışa, borana düşür. İki oğlu burada həlak olur. Deyir:

– Arvad, mənə heç nə qismət olmadı, geri qayıdırıq.

– İki kisə qızılı arvadına verib deyir:

– Bunları saxla, əgər oğlumuz olsa, mənim arxamca göndər. Yox, qızım olsa, cehiz alıb köçürərsən.

Mən on gündən artıq Aşıq Şəmşirlə bir yerdə qaldım. Sonra Aşıq Şəmşirə bildirdim ki, nəsil şəcərəsinin XVI əsrdə Miskin Abdalla başlaması mənə tədqiqatın açarını verdi. Atalar düz deyib ki, sən mənə bulağın gözünü göstər, onun axarını mən özüm müəyyənləşdirərəm. Miskin Abdalla əlaqədar İrəvan mahalının Hollavar-Pəmbək bölgəsinə gəldim. Miskin Abdalla bağlı iki ziyarətgahı axtarıb tapdım. Miskin Abdal o qədər müqəddəs bir insan imiş ki, çölün maralları onun qapısına sağına gəlirmiş. Bir gün ocaqda maral südü bişirmiş. Qəflətən südü qab kəsir. Abdal deyir:

– Arvad, oğlun Şadman ölsün. Çöldə maralların yanında adam öldürüldü, ocağıma qan düşdü. Marallar perikdi. Bir də bu qapıya gəlməz.

Bu zaman at çapa-çapa Şadman gəlir və bildirir ki, iki nəfər maral sürüsünü aparırdı. Onun birini öldürdüm. Miskin Abdal deyir:

– Mən o maralları pulla almamışdım ki... Ocağımızın müqəddəsliyinə görə özləri gəlmişdi.

O, ocağın altından odlu bir kösöv çəkib Şadmana atır. Ağac yerə sancılır. Qollu-budaqlı bir ağac olur. Həmin ağacı 1961-ci ildə mən də gördüm. Ağacın gövdəsi qapqara yanmış kösöv, başı isə yamyaşıl idi. Maymaq dağının başında Abdalın Ocaqgöl ziyarətgahı da var. Buraya gələn hər kəs gölə bir ovuc rəngarəng muncuq tullamalıdır. Beş yüz ilə yaxındır ki, bu gölə muncuq tullanır. Gün çıxanda və ya yağış yağanda gölün ətrafına qövsi-quzeh, göy qurşağı və Fatma nənənin hanasının ilmələri kimi rəngarəng zolaqlar və dairələr düşür.

Mən Hollavardan qayıdandan sonra Dağıstana getdim və orada Abdalın adını daşıyan Miskincə dağlarını seyr etdim, Miskincə kəndinə gəldim. Miskincə qəbiristanlığında Abdalın oğlunun başdaşından hündür daş yox idi. Daş öz qibləsindən çıxaraq yönünü Azərbaycana sarı çevir-

mişdi. Mən o qəbirin yanında oturub göz yaşları içində üç bəndlik qoşmamı yazdım:

**Gəzə-gəzə, ay Miskincə dağları,**
**Elə bilmə gül dərməyə gəlmişəm.**
**Şair Miskin saldı bir vaxt yurd burda,**
**Həmin yurdu mən görməyə gəlmişəm.**

**Bu dağlarda itkin düşüb qardaşı,**
**Abbdaloğlu az tökməyib gözyaşı.**
**Vətən sarı əyilib o başdaşı, –**
**Qibləsinə döndərməyə gəlmişəm.**

Nəsil-şəcərəsini öyrəndikdən sonra Ağdabanlı Qurban və Aşıq Şəmşir yaradıcılığını araşdırmaq üçün sirli-sehrli sənət məbədinin qapısını aça bildim. Ağdabanlı Qurban haqqında, Aşıq Şəmşir haqqında çox sayda məqalələr yazdım. Ağdabanlı Qurbanın şeir toplusunu çap etdirdim. Nəhayət, Aşıq Şəmşir haqqında elmi monoqrafiya yazdım.

48 ildir ki, davamlı olaraq Miskin Abdal, Ağdabanlı Qurban və Aşıq Şəmşir irsinin tədqiqi ilə məşğulam.

Aşıq Şəmşiri hərtərəfli öyrənmək çətindir. Aşıq Şəmşir yaradıcılığı dərya, dənizdir. Bu dənizdə nə qədər üzürəmsə, sahilinə çata bilmirəm. Atalar yaxşı deyib: nə dərin dəryaya gir, nə də Xızır İlyası çağır. Mən dərin dəryaya bilərəkdən girmişəm. Hər dəfə Xızır İlyası çağıraraq Şəmşir dəryasına baş vururam. Hər dəfə də ləl-cəvahir sandığından bir inci seçib götürürəm. Bu dəfə dərin dəryaya girib bir qızıl bazubənd tapıb üzə çıxardım. Heç kəsə vermədim, öz qoluma bağladım. Bu, mənim 48 illik zəhmətimin mükafatıdır. Qızıl bilərziyin üzərinə qızıl hərflərlə bu sözlər yazılmışdır: "Şəmşiri yaradan bir yol yaratdı, birdəmi təzədən yaradar indi?"...

***Qənbər Şəmşiroğlu***

## DƏDƏ

Səsim qulağına çatsın, ay dədə,
Bəlkə bu günləri görüb qalmısan.
Dedin: “Dağ oğluyam, ayrı düşmərəm”,
Dağlarla baş-başa verib, qalmısan.

Qaldın zirvəsində “Yeddiqardaş”ın,
İndi düyünlənib çatılır qaşın.
Saçın qapqaraydı – ağarır başın,
Səni tərk elədik, qərib qalmısan.

Düşmən məzarını tapdalayanda,
Bizə təhniz eylə, alış da, yan da.
Az bildik qədrini sən sağ olanda,
Hikimətdən bir qala hörüb qalmısan.

İtgin ellər üçün böyün bükürsən,
Sözünlə indi də xeyir əkirsən.
Əlində bir bayraq, haray çəkirsən,
Torpağın üstündə durub qalmısan.

Göyçə gədiyindən baxır Ələsgər,
Yəqin o ustad da gözləyir xəbər.
Şəhid balaların – Çimnazla Əkbər,
Onlarla bir süfrə sərib, qalmısan.

***Cavid Qənbəroğlu***

## BABA

Yuxumda səninlə danışıram mən,
Yenə asta-asta gülürsən, baba.
Ayılıb görürəm həyatda yoxsan,
Sanki ürəyimi dəlirsən, baba.

Sənətlə qazandın şanı, şöhrəti,
Sənə sərvət oldu xalq məhəbbəti.
Mən səndən öyrəndim şeiri-sənəti,
Hər kəlməbaşında gəlirsən, baba.

Sənsiz qəribsəyib, sazda tel ağlar,
Dağda çiçək ağlar, bağda gül ağlar.
İndi gözümüzdən axır bulaqlar,
Yurdun viran qalıb, bilirsən, baba?



**Musa NƏBİOĞLU**
**Əməkdar Mədəniyyət İşçisi**

# DƏDƏ ŞƏMŞİRİN HİKMƏT DÜNYASI

Saz bizim ən qədim musiqi alətimiz, milli varlığımızın təsdiqidir. Saz, aşıq yaradıcılığı özündə milli-mədəni dəyərləri ehtiva edən zəngin və Azərbaycan xalqı üçün səciyyəvi mədəniyyət hadisəsidir, bizim şərəfli tariximizdir. Özündə poeziya, musiqi və ifaçılığı birləşdirən aşıq sənəti həm də xalqın fəlsəfi mədəniyyətinin formalaşdığı xüsusi bədii təfəkkür sahəsidir. Ustad aşıqlar təkcə sazda çalıb-oxumaqla kifayətlənməyib, həm də özləri aşıq şeirinin müxtəlif şəkillərində söz qoşaraq insanın mənəvi dəyərlərini, əməllərini tərənnüm ediblər, əsas mövzuları da məhəbbət və təbiət gözəlliyi, tarixi qəhrəmanlarımız, bir sözlə, insan və onun əməlləri olub. Aşıq sənəti, aşıq poeziyası daim böyük humanist ideyalara xidmət edib, mənəvi dəyərlər yüksək bədii sənət dili ilə ifadə olunaraq mükəmməl estetik təqdimatla cəmiyyətə çatdırılıb. Aşıqlıq sənəti, aşıq poeziyası həm də dünyanın poetik dərkinin ifadə forması kimi özünü təsdiq edib.

XX əsrdə bu ənənəni öz yaradıcılığında davam və inkişaf etdirən böyük ustad sənətkarlarımızdan biri də öz sələfləri kimi, sağlığında klassikləşən, aşıq sənətini inkişaf etdirən, Göyçə-Kəlbəcər aşıq mühitinin inkişafında müstəsna xidmətləri olan Dədə Şəmşirdir. Təsadüfi deyil ki, professor Qəzənfər Paşayev onu "ozan-aşıq sənətinin memarlarından biri" adlandırır, Əməkdar elm xadimi, professor Məhərrəm Qasımlı isə yazır: "Aşıq şeirinin əksər şəkillərindən (qoşma, gəraylı, təcnis, divani, müxəmməs və s.) böyük məharətlə istifadə edən görkəmli sənətkar (*Aşıq Şəmşir – M.N.*) sözün çəkisinə xüsusi diqqət yetirən, hər misraya, hər kəlməyə zərgər dəqiqliyi ilə yanaşan bir sərraf idi".

XX əsrdə Azərbaycan aşıq sənətinin inkişafında böyük xidmətləri olmuş Aşıq Şəmşir – Dədə Şəmşir həm də böyük söz adamı olub. Hələ sağlığında ikən bir neçə şeir kitabı nəşr olunub, təkcə ustad aşıq kimi yox, həm də bir şair kimi diqqəti çəkib. Bunu onun poetik yaradıcılığına

həsr olunmuş monoqrafiyalar, çoxsaylı elmi məqalələr və dissertasiyalar, haqqında yazılmış kitablar da sübut edir.

Xalq şairi Osman Sarıvəllinin diliylə desək, "şair ürəkli aşıq, aşıq ürəkli şair" olan Dədə Şəmşirin şeirlərinin xalq ruhuna daha yaxın olması, klassik ustad aşıqlarda olduğu kimi, onun şeirlərinin də özündə yüksək bəşəri ideyalar daşıması, halallıq, doğruluq, yaxşılıq, xeyirxahlıq və s. kimi böyük humanist ideyalara söykənərək insanı böyük kamilləşmə yoluna aparması, onun haqq yolunda yüksəlişinə təkan verməsi xüsusilə diqqəti çəkir. Yaradıcılığında gerçəklik, dünya və insan, insan və cəmiyyət münasibətləri, mənəviyyat və insanın mənəvi dünyasının problemləri mühüm yer tutan Dədə Şəmşirin hər şeirində bir hikmət, öyüd-nəsihət və ağsaqqal məsləhəti, dədə tövsiyəsi var.

Bəşəriyyət yaranandan bu yana hər kəsi düşündürən, bütün söz adamlarının yaradıcılığında mühüm yer tutan insan və dünya mövzusuna Dədə Şəmşir də biganə qalmır. Minbir kələk gördüyü dünyanı ələyə, insanı isə una bənzədən ustad özündən əvvəlki klassiklər kimi, deyir ki, "dünyada kərəm yox, ömürdə vəfa", əcələ yalvarmağın faydası yoxdur, yüz yalvarsan da, o, "gəlməz insafa" və məlum bir həqiqəti özünəməxsus poetik dillə belə ifadə edir:

***Dünya, səndə bağ becərən bağbanın***
***Birisi əlində bar apardımı?!***

İnsanları öz hörmətini, təmiz adını saxlamağa, "şeytana lənət" deyib, "nəsə qoşulmamağa", halal zəhmətə, könül qırmamağa, "dilini qeybətdən" saxlamağa, biqeyrətdən uzaq dolanmağa çağırır və əmin edir ki:

***Olsa Haqqa məhəbbətin,***
***Gün-gündən artar hörmətin.***

***

***Bir könülü yıxan, min ev yıxandı.***

Ustad deyir ki, həyatda elə dolan ki, nə səni "hərcayı dillər aldatmasın" nə də "özünü heç tərif etmə, qoy öysün ellər səni". "Mənliyini simuzərə satana", yaltaqlara, ikiüzlülərə, "aralığı şeytan kimi qatana", "alçaq, satqın gölgəsində yatana" insan demir, öz işi düzəlsin deyə gündə min sifətə düşənlərə inanmır, onlara güvənmir, çünki yaxşı bilir ki, "yaltaqlardan arxa olmaz":

***Namərd sənin qulluğunda qul olar,***
***Öz işi düzəlib bitənə kimi.***
***İrişə-irişə üzünə gülər,***
***Əli bir tərəfə çatana kimi.***

Və çox haqlı olaraq da əsl ustad sözü deyir, dədə öyüdü verir:

***Qoy səni şir yesin, şir parçalasın,***
***Tülkü kölgəsində yatana kimi.***

Dədə Şəmşir də bir məlum həqiqətə əmindir ki, "dünya malı bu dünyada qalandı" və elə ona görə də "özgələr malından maya tutanlar"a, "halal mayasına haram qatanlar"a, dostunu mala-pula satanlara səslənərək, "halalına haram maya qatma" deyir, ilqarına sadiq olmağa çağırır:

***Özün üçün sərf eyləmə özgələrin varını,***
***Zəhmət çəkib, bağ salanlar qoy dərsin öz barını.***

Başqa bir şeirində isə yenə də ustadın ağsaqqal tövsiyəsi ilə qarşılaşırıq:

***Göz dikmə kimsənin yaşıl-alına,***
***Öz şələni özün götür dalına.***
***Evində yoxdursa, özgə malına***
***Gözünü dikməyin nə mənası var?!***

"Səxasız pul nəyə gərək" deyən ustad insanları var-dövlət hərisi olmamağa, dünya malına çox da güvənməməyə, kasıba, yoxsula əl tutmağa çağırır:

***Güvənmə dövlətə, fəxr etmə pulla,***
***Rəhm et füqəraya, dəymə yoxsula.***
*****
***Pul güdən aşıqdan kənaram, kənar,***
***Şəmşirə lazımdı düz söz, etibar.***

Ustad deyir ki, "boş xəyalların, mənasız arzuların dalınca düşməkdənsə, "elə bir bağ sal ki, dərəsən barın".

Dədə Şəmşirin yaradıcılığında diqqətçəkən məqamlardan biri də ailə, valideyn-övlad münasibətləri və tərbiyə məsələlərinə böyük yer verməsidir. Ustada görə:

***İnsanda yaxşı sifət əzəl binadan gərək,***
***Tərbiyəsi kamil ola ata-anadan gərək.***

Ustadın oğluna xitabən dediyi bu hikmətli sözlər isə bütün gənclər üçün bir ağsaqqal öyüdü kimi hər zaman aktualdır:

***Kəm baxma yediyin çörəyə, duza,***
***Doğruya doğru ol, sadiq ol düzə.***
***Eşqin mənasını duymayan qıza,***
***Bəsləmə qəlbində məhəbbət, oğlum!***

Ustadın qənaətinə görə, “ölüncə mərd olmalıdı lütfü təmiz hər oğul”, ata yurdunu ancaq qoçaq, hünərvər oğullar şən edə bilər, mərd oğul heç vaxt ata yurdunu boş qoyub başqa yerə köçməz. “Bir oğul bəd olsa ata üzünə, taleyi tərs olub, baxtı kəm olur”. Elə buna görə də məsləhət görür ki:

***Yardandan nə pul istə, nə də mal,***
***Qoy təki ağıllı övladın olsun.***

Məşhur atalar sözündə deyildiyi kimi, Dədə Şəmşir də bu qənaətdədir ki, “insanlıq çətindi, alimlik asan” və elə ona görə də “elmdən üstündü xasiyyət, oğlum!” – deyir, fitnədən, şərdən, ədavətdən, qeybətdən uzaq olmağı, haqqa söykənib halal qazanmağı, bir quruşa belə xəyanət etməməyi, Allahın verdiyinə naşükür olmamağı məsləhət görür. Bu mövzuda yazanda da bütün yaradıcılığında ana xətt kimi keçən halallıq prinsipini unutmur, “südü halal, lütfü halal olan kəs ağılda-kamalda dəngəsər olmaz”, – deyir və bu qənaətə gəlir ki, “əqli kamil olmayanlar yetişməz insanlığa”.

Arif məclisində xamlıq etməməyə, “alim yanında adamlıq” göstərməyə, elm yolunda hər əzaba qatlaşmağa çağırır:

***Elm üçün özünü etməyən nökər,***
***Bütün ömrü boyu ahu-zar çəkər.***

** * **

***Yüz haram qazancdan savad yaxşıdı,***
***Onun kimi yoldaş, yar ola bilməz.***

Sözün məna tutumuna, deyiləcəyi məkan və zamana diqqəti çəkən ustad oxucusunu, dinləyicisini də sözlə ehtiyatlı olmağa, deyilən sözün

yerini bilməyə, məsuliyyətini dərk etməyə çağırır, fırıldağı, yalanı lənətləyir. Zəngin həyat təcrübəsinə və dərin müşahidəsinə söykənərək deyir ki, “söz batmaz beyninə hər ağlı azın, inanma sözünə sən kələkbazın” və böyük Nizami Gəncəvi ilə səsləşən fikirlər söyləyir:

***Hədər söz insanı doğrayar, kəsər,***
***Hər nə söhbətin var, eylə müxtəsər.***
** * **
***Qılınc yarasını qurtaran loğman,***
***Məzəmmət dərdinə tapmadı dərman.***
** * **
***Ləl mətahın düşər şor bazarına,***
***Bilib qiymətini, alan olmasa.***

“Kişi bütün olar sözdə” deyən ustad haqlı olaraq yazır ki, “doğru-luqdan qeyri şeylər yalandı”, dosta yalan satmamağı, əsl dostun qədrini bilməyi, “çoxlu ev tikincə, çoxlu dost” qazanmağı məsləhət görür:

***Dostun bir görüşü dəyər min aya,***
***Xoş keçən bir günə il çata bilməz.***

Eyni zamanda “bivəfa yoldaşa, biilqar dosta” sirr bildirməməyi, ancaq mərdlərə güvənməyi tövsiyə edir.

“İnsan ol, insana bəslə məhəbbət” – deyən Dədənin öyüdlərindən biri də budur ki, “namərdə yalvarmaq insafdan deyil, düşmənə yaltaqlıq mərdə yaraşmaz”, – deyərək mərdin yolunda candan-başdan keçməyə çağırır, “nainsafın qılınc ilə nəslini kəsmək gərək”, – deyir. Çünki ustadın qənaətinə görə, “mərd igidin qaydasıdır dünyanı var istəmək, bir bəşərin şad gününü mərdimazar istəməz”.

Zalımı, çağırsan da, dada yetişməz, çünki “Şəmşir çox imtahan edib dünyada”, xalqa quyu qazanı zəlil görüb həmişə. Ustada görə, mərdlik də, kişilik də, səxavət və xeyirxahlıq da gərək insanın qanında olsun, ata-babasından, anasının südündən gəlsin:

***Gədadan pay umma – səxası yoxdu,***
***Atası verməyib, özü də verməz.***
** * **
***Hansı bir insanı mərd doğub ana,***
***Yol verməz böhtana, şərə, şeytana.***

Aşıq Şəmşirin bədii yaradıcılığına, onun hikmət dünyasına etdiyimiz bu qısa səyahət göstərir ki, professor İsmayıl Məmmədlinin də qeyd etdiyi kimi, "Aşıq Şəmşir hələ gəncliyindən çəkinmədən öz mövqeyini ifadə edən, öz məsləki-əqidəsi olan bir sənətkar kimi el içində tanınmışdır". Və bütün bunlar onun hələ erkən yaşlarında dədəlik mərtəbəsinə ucalmasının, hər yerdə ona "DƏDƏ" deyə müraciət olunmasının təsadüfi olmadığını göstərir.

## *DƏDƏ ŞƏMŞİRİN HİKMƏT DÜNYASINDAN SEÇMƏLƏR*

İnsanda yaxşı sifət əzəl binadan gərək,
Tərbiyəsi kamil ola ata-anadan gərək.

* * *

Aralığı şeytan kimi qatana insan demə,
Alçaq, satqın kölgəsində yatana insan demə.

* * *

Mənliyini simu-zərə satana insan demə,
Yaltaqlardan arxa olmaz, üzündən qaçmaq gərək.

* * *

Mərd igidin qaydasıdır dünyanı var istəmək,
Bir bəşərin şad gününü mərdimazar istəməz.

* * *

Əqli kamil olmayanlar yetişməz insanlığa.

* * *

Yaxşılara yoldaş olun, şərdən, şeytandan qaçın,
El içinə fitnə salan aravurandan qaçın.

* * *

İxtiyarın çatan kimi bəd danışıb, vurma dəm,
Ədalət, divan yanında qoyma dilin ola lal.

* * *

Özün üçün sərf eyləmə özgələrin varını,
Zəhmət çəkib, bağ salanlar qoy dərsin öz barını.

* * *

Bağban oldum, bağ becərdim, dərmək üçün bar gərək,
Vəfalı dost arasında namus, qeyrət, ar gərək.

* * *

Yaxşı dosta yalan satma, olma üzüqara sən,
Gələcəyin anla, düşün, həqiqəti ara sən.

* * *

Bivəfa yoldaşa, biilqar dosta,
Sirini bildirmə, elə yayılar.

* * *

İnanma, “Baharam!”, – desə zimistan,
Namərdlə gül əkmə, bəy ilə bostan.

* * *

Lütfü təmiz, əsli-zatı pak olan,
Nə dosta kəm baxar, nə üzdən keçər.

* * *

İnsan özlüyündə sınaqlı varlıq,
Mədlərin qəlbində tapılmaz darlıq.

* * *

Bir könülü yıxan, min ev yıxandı.

* * *

Cəhənnəm xəlq olub, alçaq, xainə,
Müqəddəs insana cənnət yaranıb.

* * *

Hədər söz insanı doğrayar, kəsər,
Hər nə söhbətin var, eylə müxtəsər.

* * *

Çoxlu ev tikincə, çoxlu dost qazan,
Nə vaxtı-vədəsi ötməmiş hələ.

* * *

Dostun arasında iki alma var,
Bilməzsən, bağında bitməmiş hələ.

* * *

Bir kəsə qalmadı dünyanın varı,
Hanı xan-xaqanlar, getdimi? Getdi!

* * *

Özgələr malından maya tutanlar,
Halal mayasına haram qatanlar,
Yaxşı dostu mala-pula satanlar,
Alçaqlar, nadanlar, getdimi? Getdi!

* * *

Təbibsiz bir xəstə çətin sağalar,
Olmasa dərdinin şəfa dərmanı.

* * *

Yaxşılıq bir evdi, lazımdı tikmək,
Xətiri, hörməti olarmı tökmək?!

* * *

Sənin, özgələrə atdığın kəmənd,
Dolaşar əlinə – tez yıxar səni.

* * *

Qılınc yarasını qurtaran loğman,
Məzəmmət dərdinə tapmadı dərman.

* * *

Sinmə pənahına səyin, sarsağın,
Toplanar qəlbinə qəm yığın-yığın.

* * *

Can versən, əyilmə nanəciblərə,
Qul ol, qulluq eylə ər oğlu ərə.

* * *

Söz batmaz beyninə hər ağlı azın,
İnanma sözünə sən kələkbazın.

* * *

İnsan gərək qəm yuxusu yatmaya,
Mayasına zərrə haram qatmaya.

* * *

Zəlil gördüm xalqa quyu qazanı.

* * *

Kəm baxma yediyin çörəyə, duza,
Doğruya doğru ol, sadiq ol düzə.
Eşqin mənasını duymayan qıza,
Bəsləmə qəlbində məhəbbət, oğlum!

* * *

Elm üçün özünü etməyən nökər,
Bütün ömrü boyu ahu-zar çəkər.

* * *

Ustad oğlu olsa ustad, yaxşıdı,
Şəmşirəm, əyilməz polad yaxşıdı,
Yüz haram qazancdan savad yaxşıdı,
Onun kimi yoldaş, yar ola bilməz.

* * *

Səxalı mərd daldalamaz çörəyin.

* * *

Yaranmış bəşərə söymək eyibdir,
Ellər söyən kəsə söyməsən, olmaz.
İnsana yaraşmır özünü öymək,
Yer var ki, özünü öyməsən olmaz.

* * *

Dünyanın yaşı çox, hüsnü cavandı,
Tərlan qocalsa da, yenə tərlandı.

* * *

Dərəcək barını gül əkən bağban,
Zəhmətin şəhrində görünməz duman.

* * *

Güclüyə küsənib, fağıra gülmə,
Özünü dağlardan çox uca bilmə.

* * *

Fırıldağa lənət, yalana lənət,
Kişi bütün olar sözdə, qaydadı.

* * *

Bir oğul bəd olsa ata üzünə,
Taleyi tərs olub, baxtı kəm olur.

* * *

Gədadan pay umma – səxası yoxdu,
Atası verməyib, özü də verməz.

* * *

Kimsənə olmasın namərd möhtacı,
Sən şəkər istəsən, duzu da verməz.

* * *

Dərdi-hicran yaralamış bədəni
Qızıla bükməyin nə mənası var?!

* * *

Yardandan nə pul istə, nə də mal,
Qoy təki ağıllı övladın olsun.

* * *

Alimin yanında göstər adamlıq,
Arif məclisində eləmə xamlıq.

* * *

Çağırma, dar gündə gəlməz haraya,
Binamusa, qurumsağa inanma.

* * *

Özgə danasını bağlayanların
Çatısı əlində qalacaq bir gün.

* * *

Dünya, səndə bağ becərən bağbanın
Birisi əlində bar apardımı?!

* * *

Səxalı süfrədən çörək azalmaz.

* * *

Namərd sənin qulluğunda qul olar,
Öz işi düzəlib bitənə kimi.
İrişə-irişə üzünə gülər,
Əli bir tərəfə çatana kimi.

* * *

Qoy səni şir yesin, şir parçalasın,
Tülkü kölgəsində yatana kimi.

* * *

Tufan sovuşmasa, durulmaz dəniz.

* * *

Özünü heç tərif etmə, qoy öysün ellər səni,
Sayıq dolan, aldatmasın hərcayı dillər səni.

* * *

Yaxşı dosta yalan satma, etibar əldən gedər,
Həm məhəbbət, həm sədaqət, düz ilqar əldən gedər.

* * *

Saxla hörmətini, təmiz adını,
Şeytana lənət de, nəsə qoşulma.

* * *

Güvənmə dövlətə, fəxr etmə pulla,
Rəhm et füqəraya, dəymə yoxsula.

* * *

Alçaq iş dalınca su kimi axma,
Xainə, xəbisə, nakəsə baxma,
Zinakar oduna özünü yaxma,
Qoy tapan olmasın səndə bir qüsur.

* * *

Pirinə kəm baxar fitnə, qudurğan,
Mirvari qədrini bilərmi nadan?!

* * *

Şişdə nə günah var, oddu yandıran,
Kabab hey alışa közün üstündə.

* * *

Namərdə yalvarmaq insafdan deyil,
Düşmənə yaltaqlıq mərdə yaraşmaz.

* * *

İlana inanaıb, qoynuna alma,
Bacarsa, gözündən vuracaq sənin.

* * *

Hələ ki, cavansan, ucalacaqsan,
Gülmə qocalana, qocalacaqsan.

* * *

Az olan iş üçün acığa gəlmə,
Mənasız danışıb, əfsanə gülmə,
Söylə kifayətlə bir neçə kəlmə,
Ancaq məzmununda kəsər arzula.

* * *

İnsan ol, insana bəslə məhəbbət!

* * *

Yaxşılıq bacaran yaxşı insanın
Haqqında yamanlıq eyləmək olmaz.

* *

Bu çərxi-gərdişin imtahanı var,
Haqq var, ədalət var, çəkmə intizar.

* * *

Sən qəlbi ipək ol, daş, dəmir olma,
Qohuma, qonşuya bədfikir olma,
Yaxşı gün görəndə naşükür olma,
Gözəl gün hər zaman ələ düşərmi?!

* * *

İnsanlıq çətindi, alimlik asan,
Elmdən üstündü xasiyyət, oğlum!

* * *

***Unutsaq – unudularıq***

**Səməndər MƏMMƏDOV**
**Azərbaycan Yazıçılar Birliyinin üzvü**



# TORPAQ MƏCNUNU

***Ziyalı o deyil ki, savadlıdır, o adamdır ki, keçmişlə gələcək arasında özünün yerini müəyyənləşdirə bilsin.***
**Volter**

Hər dəfə onu xatırlayanda, yaxud hansısa məclisdə onun haqqında söz düşəndə yadıma ilk düşən Volterin yuxarıdakı dahiyanə fikri olur. Və düşünürəm ki, görəsən niyə bəzən hər əlidiplomluya ziyalı deyirik. Bəyəm, ali təhsilli olmaq ziyalı olmaqmı deməkdir? Əslində ziyalı kimdir? Bəli, ziyalı, Volterin də dediyi kimi, təkcə savadlı olan yox, “keçmişlə gələcək arasında özünün yerini müəyyənləşdirə” biləndir. Cəmiyyətdə özünü təsdiq edən, hər məclisdə yuxarı başda yeri görünən, sözünə-söhbətinə, dəyərli məsləhətlərinə, ağsaqqal öyüd-nəsihətlərinə ehtiyac duyulandır.

Şəxsi münasibətim olmasa da, tanınmış ictimai xadim və pedaqoq, Yeni Azərbaycan Partiyası Siyasi Şurasının üzvü, Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdçüsü olmuş Əməkdar Elm Xadimi, filologiya elmləri doktoru, professor Həsən İbrahim oğlu Mirzəyev – Həsən Mirzə mənim üçün məhz belə ziyalılardan olub. Onu respublikamızda elmi ictimaiyyət arasında nüfuzlu bir alim olmaqla yanaşı, həm də bütöv bir şəxsiyyət kimi tanımışam. Elə bir şəxsiyyət ki, təkcə bir kəndin, bir elin-obanın yox, bütövlükdə millətin ağsaqqalı kimi tanınıb, alim kimi öz hücrəsinə qapılıb qalmayıb, cəmiyyətdə baş verənlərə hər zaman özünəməxsus təmkinli münasibəti ilə seçilən ictimai xadim olub. İki çağırış Azərbaycan Respublikası Milli Məclisinə deputat seçilib. Sözün əsl mənasında xalq elçisi olub, xalqın elçisi olub. Millət və dövlət üçün taleyüklü məsələlərdə sözünü ən ali tribunadan cəsarətlə deyib. Məqamında sözünü deyib. Haqqın, haqlının yanında olub, haqq sözü mərdanə deyib. Millət vəkili kimi də peşəkarlıq nümunəsi göstərib.

Özüm də ixtisasca filoloq olduğumdan, Həsən müəllimin Azərbaycan filoloji elmindəki yerini və sanbalını yaxşı bilirəm. Respublikamızda tanınmış dilçi alimlərdən olduğunu, 1965-ci ildə namizədlik, 1987-ci ildə

doktorluq dissertasiyaları müadifə etdiyini, uzun müddət kafedra müdiri kimi fəaliyyət göstərdiyini, 200-dən çox elmi əsərin, o cümlədən 25 kitabın (bunlardan 10-u monoqrafiyadır), 8 tədris proqramının, 100-dək publisistik məqalənin müəllifi, eyni zamanda 42 monoqrafiya, dərs vəsaiti, metodik göstəriş və tədris proqramının, 9 dərslik və dərs vəsaitinin elmi redaktoru, 6 bədii əsərin redaktoru, neçə-neçə elmlər namizədi və doktorlarının elmi rəhbəri və ya rəsmi opponenti olduğunu da yaxşı bilirəm.

Həsən Mirzəyevin elmi fəaliyyəti dilçilik elminin müxtəlif bölmələri ilə bağlı olsa da, o, feilin tədqiqatıçısı kimi özünün məktəbini yaradan, feil mövzusunda ən görkəmli tədqiqatçı kimi tanınan böyük alimdir. Bu sahədə uzun illər apardığı elmi tədqiqatla yanaşı, həm də filologiya fakültəsinin tələbələrinə mühazirələr oxuyub, seminar məşğələləri aparıb.

Uzun illər Azərbaycan Dövlət Pedaqoji Universitetində, Azərbaycan Milli EA-nın Dilçilik İnstitutunda, Bakı Dövlət Universitetində dilçilik üzrə ixtisaslaşdırılmış müdafiə şurasının üzvü olub.

Həsən Mirzəni görkəmli alim və ictimai-siyasi xadim kimi yüksək dəyərləndirən filologiya elmləri doktoru, professor Buludxan Xəlilov haqlı olaraq yazır: "Həsən Mirzəyev Azərbaycan filologiyasının inkişafında, eyni zamanda ictimai-siyasi düşüncənin irəliyə getməsində, vətəndaş cəmiyyətində kimin kim olduğunu ictimaiyyətə tanıtmaqda obyektiv mövqeyi olan bir ictimai xadim idi".

Həsən Mirzəyevin yaradıcılığında aşıq poeziyasına dair tədqiqatlar, aşıqlarımızla bağlı elmi-publisistik yazılar da mühüm yer tutur. O, aşıq yaradıcılığında şəxs adlarını, toponimləri, hidronimləri, tayfa adlarını və s. araşdırmaqla milli-mənəvi dəyərlərimizin öyrənilməsinə böyük töhfə vermişdir.

Onun qələminin məhsulu olan "Dərələyəz mahalının toponim və şivə sözləri", "Qərbi Azərbaycanın Dərələyəz mahalı" kitabları isə alim təfəkkürü və zəhmətinin məhsulu olmaqla yanaşı, həm də vətəndaşlıq xidmətidir. Elə bir xidmət ki, Azərbaycan xalqına, dövlətimizə və dövlətçiliyimizə, mədəniyyətimizə xidmət kimi illər keçdikcə dəyəri daha da artacaq.

Həsən Mirzənin bir alim kimi keçdiyi ömür yolunda yazıb-yaratdıqlarından sadaladığım bu nümunələr olsa-olsa bu zəhmətkeş alimin hər kəsə qismət olmayan zəngin bioqrafiyasının ayrı-ayrı səhifələrindən seçmələrdir, nümunələrdir. Və mən inanıram ki, onun alim kimi keçdiyi ömür yolundan bəhs edən neçə-neçə elmi əsərlər yazılacaq, dissertasiyalar müdafiə olunacaq.

Həsən Mirzə həm də sazın-sözün – aşıqların dostu, şair qəlbli bir insan, əsl könül adamıydı. Poetik nümunələrindən ibarət kitabları da nəşr

olunub. Aşıqlarımız sevə-sevə onun şeirlərini oxuyurlar. Şair kimi qələmini müxtəlif mövzularda sınasa da, daha çox Vətən sevgisindən, yurd həsrətindən, itirdiyimiz torpaqların nisgilindən yazıb, bu torpaqların mütləq işğaldan azad ediləcəyinə inanaraq yazıb.



Qərbi Azərbaycanın, xüsusən də Dərələyəz mahalının hər daşına, qayasına bələd olan, bu yerləri el-el, oba-oba gəzən Həsən müəllim eşitdiklərini, gördüklərini və bildiklərini həm də bir alim gözü ilə nəzərdən keçirib, bir vətəndaş alim kimi tədqiq edərək geniş ictimaiyyətə çatdırmağı özünə borc bilib. Onun Dərələyəz mahalı haqda yazdıqları da çoxdur. Bu mövzuda cild-cild kitabları var. Bu yazıda məqsədim onun Dərələyəzələ bağlı yazdıqlarından söhbət açmaq olmasa da, bir misal gətirmək istəyirəm.

Dərələyəzdəki məşhur Salsal qalası haqda geniş elmi-publisistik məqalə yazan H.Mirzənin tədqiqatlarından öyrənirik ki, Salsal həm qala, həm də məşhur sərkərdə adıdır və qədim tayfa (Sal tayfasının) adından götürülmüşdür. O, bu qənaətə gəlir ki, "Dərələyəzdəki Salsal qalası azərbaycanlıların qədim babalarına məxsus olmuş və onlar burada xarici istilaçılara və digər düşmənlərə qarşı döyüşmüşlər".

Salsal qalası haqqında tarixi faktları, rəvayətləri yazıya alan Həsən Mirzə bu tarixi abidə haqqında fikirlərini həm də poetik dillə ifadə edir:

*Salsalın qalası məğrur, vüqarlı,*
*Qoçdaşlı qəbirlər sinəsi dağlı.*
*Alban kilsələri sirli, soraqlı,*
*Salıb tarixə iz Dərələyəzdə.*

"Babasının izi", nənəsinin sözü, Türk-oğuz yurdunun gözü olan yurdu-yuvası, məskəni əldən gedən Həsən Mirzə tapdanan, param-parça olan vətənin nisgilinə dözə bilmir, bu gün aşıqların dilinin əzbəri olan "Dərdimi" rədifli şeirində öz dərdini poetik dillə ifadə edərək, "dərdimi ilə söyləsəm, qurtarmaz, filə yükləsəm, çəkəmməz" deyərək haray çəkir. Mənim dərdimi "aqillər dilə gətirsin, aşıqlar elə söyləsin", – deyir. Dərdinin çarəsini torpaqlarımızın düşmən tapdağından xilasında görür:

*Düşmən əlindədir müqəddəs yerim,*
*Ləlim, cəvahirim, abidəm, pirim.*
*Qoy ayağa qalxsın igidim, ərim,*
*Bəlkə, bu şad xəbər silə dərdimi.*

Onun bu şeirinə Xalq şari Zəlimxan Yaqub, Alqayıt, Səadət Buta və onlarla digər şair və aşıqlar nəzirə yazıblar.

Həsən Mirzənin aşıq sənətinə, poeziyaya bağlılığından danışıb da, onun Xalq şairi Zəlimxan Yaqubla dostluğundan söhbət açmamaq insafsızlıq olar. Onların arasında səmimi dostluğun, ata-oğul münasibətinin olduğunun canlı şahidiyəm. Təsadüfi deyildir ki, Həsən Mirzə 2015-ci ilin fevralında dünyasını dəyişərkən bundan ən çox təsirlənənlərdən biri bu gün özü də Haqq dünyasında olan Zəlimxan Yaqub idi. Sevimli şairimiz dostunun ölümündən təsirlənərək keçirdiyi hissləri şeirin ecazkar diliylə qələmə alaraq yazmışdı:

*Həsən Mirzə, dost itirmək ağırdı,*
*Dost itirən fağırlardan, fağırdı.*
*Yetim qalan yoldu, izdi, çığırdı,*
*Sənsiz qaldı çölüm, düzüm, çəmənim.*

Həsən Mirzəyə xitabən "Sən yoxsansa, mən də yoxam dünyada", – deyən Zəlimxan Yaqub haqlı olaraq onu "ayrılığın həsrətini, qəmini çörək kimi yeyə-yeyə", öz yurdunu öyə-öyə yaşayan "torpaq Məcnunu" adlandırır.

Əməkdar Elm Xadimi fəxri adına, Prezident təqaüdünə və "Şöhrət" ordeninə layiq görülməsi onun zəhmətinin dövlətimiz tərəfindən layiqincə qiymətləndirilməsinin sübutu olmaqla yanaşı, həm də onun vətəndaş-alim kimi keçdiyi mənalı ömür yolu və zəngin həyat təcrübəsi ilə elmimizə və elimizə, xalqımıza başucalığı gətirdiyinin göstəricisi, eyni zamanda dövlətimiz və dövlətçiliyimiz var olduqca qədirbilən xalqımızın yaddaşında əziz bir xatirə kimi yaşayacağının da qarantıdır.

**Əli ŞAMİL**
**AMEA Folklor İnstitutu**

# AŞIQ QARANININ ÖMÜR YOLUNUN DƏQİQLƏŞDİRİLMƏSİ PROBLEMİ

**Özət:** *Çıldır-Axısqa aşıq məktəbinin istedadlı sənətkarlarından biri olan Qul Qaranının ömür yolu bu günədək dəqiqləşdirilməyib. 18-19-cu yüzillikdə yaşamış aşığın ləqəbi bilinsə də adı, atasının adı, ustadı və şagirdləri haqqında dəqiq bilgi yoxdur. Xəstə Hasanın "Sözdə bir" divanisində və aşıq haqqındakı dastan rəvayətdə Qul Qaranıdan söz açılır. Oradan öyrənirik ki, İrfani (Urfanı), Küfdadi, Usta Polad, Qara Zülalla çağdaş olmuıdur. Açığın şeirləri və ləqəbi təsəvvüflə sıx bağlı olduğunu göstərir.*

**Açar sözlər:** *Qul Qaranı, Xəstə Hasan, İrfani (Urfani), Usta Polad, Çıldır-Axısqa aşıq məktəbi.*

**Abstract:** *The life of Gul Garani, one of the talanted ashugs of Childir-Ahiska environment, wasn't learned untill today. Even if known the nickname and period he was lived – 18-th-19th cnturies, researchers still couldn't get any information about his name, father name, master's and student's name. On the poem of "Sözdə bir" belonging to Hasta Hasan and also on the legend about the life of Hasta Hasan talks about the Gul Garani. Thanks to these texts, we can learn that, Gul Garani was lived at the same period with İrfani (Urfanı), Kufdadi, Usta Polad, Gara Zulal. The poems and nickname of ashug shows that, Gul Garani was the mystic.*

**Key words:** *Gul Garanı, Hasta Hasan, Irfani (Urfani), Usta Polad, Childir-ashug school*

## Giriş

Sovetlər Birliyi 70 ilə yaxın "dəmir pərdələrlə" özünü düşməni saydığı qonşularından qorumağa çalışdı. Lakin bütün cəhdlər puça çıxdı. Sərhədlər açılanda aydın oldu ki, ideolgiyalarında, idarəetmələrində, iqtisadiyyatlarında olan fərqlərə baxmayaraq Sovetlər Birliyi ilə Türkiyə arasında oxşar cəhətlər də vardır. 20-ci yüzildə istər Azərbaycanda, istər Türkiyədə yaşamış aşıqların doğulduğu illərdə bir qeyri-dəqiqlik var. Rusiya Azərbaycanı işğal eədndən sonra vergi toplamaq üçün kameral dəftərlər tərtib etmişdir. Osmanlı dövlətində də təhrir dəftərləri vardır. Aşıqlarımız haqqında yazan araşdırıcılar nədənsə təhrir və kameral dəf-

tərlərdən istifadə etməmişlər. Halbuki, orada hər bir adamın doğulduğu illə yanaşı, atasının və övladlaırnın adı, malı-mülkü də göstərilir.

Müharibələr, sürgünlər yalnız şəhər və kəndləri xaraba qoymamış, həm də insanların ölümünə, faciələrə, mədəniyyətlərin məhvinə səbəb olmuşdur. Qüdrətli Osmanlı dövləti 20-ci yüzilliyin başlarında dünyanın güclü imperiyaları tərəfindən məhv edilsə də, onun xarabalıqlarında qurulmuş gənc Türkiyə Cümhuriyyətinin dirçəlməsi bir çox Avropa dövlətləri kimi, Rusiyanı da qorxuya salımışdır.

Rusiyanın yerində qurulmuş Sovetlər Birliyi sözdə xalqların himayəçisi, azadlıq və sülh carçısı kimi özünü təqdim etsə də, əslində imperiya siyasətini yeritmişdir. Türkiyənin güclənməsi onun müstəmləkə boyunduruğu altında saxladığı xalqların azadlıq mübarizəsini gücləndirəcəyindən qorxuya düşərək Güney sərhədləri boyundakı türk xalqlarını ata-baba yurdlarından sürgün etmişdir. 20-ci yüzilliyin 20-30-cu illərində sürgünə ayrı-ayrı qruplar, bəzən bütöv kəndlər halında göndərilirdisə, İkinci dünya savaşının sonunda Qaraçaylar, Balkarlar, Axısqa və Krım türkləri, eləcə də, başqa xalqlar ellikcə sürgün edildilər. Folklorumuzu, adət-ənənələrimizi yaxşı bilən insanların bir çoxu müharibədə və sürgünlərdə öldüyündən bildiklərini də özləri ilə aparmışlar.

Bir tərəfdən də hökumətin vətən xaini kimi təbliğ etdiyi xalqların folklorunu toplamağa, nəşr etdirməyə heç bir araşdırıcı cəsarət etməmişdir. Rejimdə yumşalma başlayanda araşdırıcıların maddi imkanları yox idi ki, sürgün olunanların arxasınca Qazaxıstana, Qırğızıstana, Özbəkistana gedib folklor nümunələri toplasınlar və ya araşdırma aparsınlar.

Türkiyə araşdırıcıları isə başqa bir problemlə üzləşmişdilər. Cıldır-Kars-İğdir Azəri bölgəsi adlandırılaraq diqqətdən kənarda saxlanılırdı. Bu da səbəbsiz deyildi. Türküyə gündən-günə güclənən, hətta ondan məsafəcə çox-çox uzaqda olan Vyetnamı, Koreyanı, Kubanı və b. ölkələri təsir dairəsində saxlayan Rusiyanı qıcıqlandırmaq istəmirdi.

### 1.**Qul Qaranı haqqında araşdırmalar**

Araşdırıcılarımız Qul Qaranı haqqında yazarkən qaynağa rast gəlmədiklərin qeyd etmişlər. Onlar alan çalışmaları zamanı topladıqları şifahi bilgilərə dayanmışlar. 1966-cı ildə Ankarada çap olunmuş "Kars Turizm ve Tanıtma Dernegi Yayınları"nın 5 sayında Ardahan xalq şairlərindən söz açılarkən yazılıb: "1. Qaranı. Dəyirman köyü. 18 yüzyıl. Axıskalı Xasta Hasanın çağdaşı...3. Dursun Kaşifi. Dəyirman köyü. 1797-1865. İkraminin babası."

Eyni kənddən olan iki çağdaş sənətkardan birinin dəqiq doğum və ölüm tarixi, oğlunun adı verilsə də, Qaranının haqqında bu bilgilər verilməyib. Aşıq Şenlik haqqındakı araşdırmaların çoxunda isə Xəstə Hasanın “Yüzdə bir” divanisi verilib. Orada da Qul Qaraninin adı çəkilib. (Erdener Aşık İslam, 1960: 18, Özbék Orhan, 1969:10-11 Aşıkoğlu İsmail, 1964, Arslan Enser, 1975: 74). Ensar Aslan isə yazıb: “Garani, Kul Karani 18 yüzyılda yaşamış, Ardahanın Degirmen köyünden bir aşık” (Arslan Enser, 1975: 411). Aşıq Şenlik şeirlərinin son və təkmil nəşirlərindən sayılan “Çıldırlı Aşıq Şenlik. Divanı (Hayatı, şiirleri, atışmaları ve hekayelerı) kitabında isə sənətkarın yüksək qiymətləndirdiyi aşıqların adları belə sıralanır: “Azerbaycan sahasında Şemkirli Aşık Mirze, yeğeni Aşık Hüseyn, Gögçeli Aşık Elesger, havetli Hasta Hasan, Çöllü İsmayıl, Doğu Anadoluda Aşık Karani, Çildırlı Hoca İrfani, Molla Halis,... şiirlerinde öne cekmişler.”

Həmin kitaba yazdığı ön sözündə A.Barat Alptekin ilk dəfə Aşıq Nurunun doğum və ölüm tarixini müəyyənləşdirərək yazır: “Nuri (Lebisli). 1811-1885-ci yılları arasında Gürcüstanın Ahıska vilayetinin Ahırkelek kazasının Lebis köyünde yaşamış olan Aşık Nuri Xasta Hasanın çırağıdır. Sazı ve sözü Xasta Hasandan öğrenmiştir. Çıldırlı Aşık Şenliyin saz ustadıdır.” (Çıldırlı Aşık Şenlik, 2007: 44)

Türkiyə araştırıcılarının əksəriyyəti Qul Qaranını Ardahanlı, bir az da dəqiqləşdirənlər Ardahanın Dəyirman köyünden hesab edirlər.

1980-ci illərdən Sovetlər Birliyində Xəstə Hasan haqqında çap olunan yazılarda Qul Qaranı adı çəkilməyə başladı və ömür yolunun, yaradıcılığının öyrənilməsinin vacibliyi irəli sürüldü. (Hacıyev V., 1983: 12 aprel, Şamilov Ə.,1984: 20 Mart, Şamilov Ə., 1986: 1iyul) 1990-cı illərdən isə bu məsələyə diqqət artdı. Valeh Hacıyev büyük tirajla çap etdirdiyi “Folklorumuzun üfüqləri. (Azərbaycan-Gürcistan əlaqələri tarixindən)” kitabında yazdı: “Xəstə Hasan dövrünün görkəmli sənətkarları Qul Qaranı, Usta Polad, Ömər, İlfani, Sefili ilə deyişmiş, yüzlərlə ustadnamənin, divaninin, təcnisin və bir neçə dastanın yaradıcısı kimi tanınmışdır” (Hacıyev V., 1991: 22) Müəllif 2005-ci ildə Bakıda çap etdirdiyi “Gürcüstanda Türk xalq ədəbiyyatı ənənələri” kitabında da Qul Qaranı haqqında yuxarıda dediklərini təkrarlamışdır. (Hacılı Valeh, 2005: 160-162)

Şurəddin Məmmədli Qarapapaq 2000-ci ildə çap etdirdiyi “Borçalı ədəbi mühiti” kitabında Xəstə Hasandan söz açarkən sənətkarın “Qərənəyə şagirdlik edib, Xəstə Qasımı özünə ustad sayıb” ifadəsilə kifayətlənmişdirsə (Qarapapaq Şurəddin Məmmədli, 2000: 112), 2004-cü ildə çap etdirdiyi “Borçalı-Ahıska-Kars ortaq ədəbi arealı” kitabında Qul

Qaranıya fəsil ayırıb. (Qarapapaq Şurəddin Məmmədli, 2004: 25-30). Bu Qul Qaranı haqqında gördüyümüz ilk məqalədir.

Araşdırıcı məqaləsində yazılı qaynaqlardan istifadə etmiş, Qul Qaranı haqqında daha geniş bilgi vermişdir. Əsasən, özünün topladıgı materiallardan və S.Mümtaz adına Azərbaycan Dövlət Ədəbiyyat və İncəsənət Arxivində Ziyəddin Əfəndiyevin fondunda saxlanan "Cüng-bayaz"dan (fond 533. saxlama vahidi 63, 64) istifadə etmişdir.

Araşdırıcı bu fikırdədir ki, sənətkar Üveysilik-Qərənilik təriqətinə bağlı olduğuna görə təxəllüsünü Qərəni götürüb. Topladığı bilgilərdən bu qənaətə gəlir ki, "Qaranı Axıska tərəfdə doğulmuş, orada və Borçalıda məşhurlaşmışdır... Borçalının Bəylər kəndində olub, 19-cu yüzilliyin birinci yarısında yaşayıb". Müəllif Borçalının Qoçulu kəndində yaşayan Qəhraman Ömər oğlu Süleymanovun dediyi: "Aşıq Qul Qaranı Borçalı mahalımızın Bəylər kəndindəndir" fikri üzərində ciddi dayanmır. Amma yazır: "Qul Qərəninin şeirləri indi də Borçalıda elin hafizəsində yaşayır və bu da onun Borçalıyla bağlılığı faktının müəyyən anlamda dəstək-lənməsinə kömək edir". (Qarapapaq Şurəddin Məmmədli, 2004: 25).

Onun bir az tərəddüdlə söylədiyi fikirlə razılaşırıq. Çünki aşıq gəzərgi bir insan olub. Qaranının də Borçalıya gəlməsi, məclislər apar-ması, müəyyən müddət burada qalması mümkündür. Amma onun Bəylər kəndindən olmasını sübutlayan elə bir dəlil yoxdur. Aşığın yaşadığı dövr bizdən çox da uzaqda deyil. Çağdaşımız olan yaşlı nəsil onun oğul-uşağını xatırlayardı. Şurəddin Məmmədli Qarapapağın məqaləsinin ətək yazısındakı "Borçalının Bəylər, Saraçlı, Kosalı, Qaracalar kəndlərində Qərənizadə soyadı indi də qalmaqdadır" fikri hələ həmin nəsillərin Qul Qaranıyla bağlı olduğunu sübutlayan dəlil deyil. Olsa-olsa, bu, soyad oxşarlığıdır.

Şurəddin Məmmədli Qarapapaq Qul Qaranı haqqında dəyərli bilgi-lər verir. Lakin bəzi yerlərdə qaynaq göstərməməsi özündən sonrakı araşdırıcıları çətin vəziyyətdə qoyur. O yazır: "İndiyə qədər bilginlər (Ensər Aslan, Əflatun Saraçlı, Əsəd Əliyev, Məmməd Sarvan, Tinatin Məmmədova və başqaları) Qul Qaranının yalnız adını çəkməklə, onu Borçalı ədəbi mühitinin qüdrətli nümayəndələrindən biri kimi təqdim etməklə yetərləniblər, məlumat azlığı səbəbindən onun barəsində geniş danışa bilməyiblər". (Qarapapaq Şurəddin Məmmədli, 2004: 25). Bilinmir ki, yuxarıda adı çəkilən araşdırıcılar hansı yazılarında Qul Qaranının adını çəkiblər.

Yaxud araşdırıcı Qul Qaranının təxəllüs götürməsindən söz açarkən aşağıdakı şeiri verir:

*Ərş üzündə pərvaz edən buludlar,*
*Gözlərim oxşatdı ay ağa səni.*
*Hər qətrəsi tutar bir əzim mələk,*
*Əmirsiz qoymazlar ay ağa səni.*

*Müşkül olsa, həkim atar nəxandan,*
*Qorxum yoxdur nə sultandan, nə xandan,*
*Mələkülmövt bir gün tutar yaxandan,*
*Qoymaz ki, qalxasan ayağa səni.*

*Cəhd eylə, Qərani, qıl beş vaxtını,*
*Günahkar olarsan, tərk et taxtını,*
*Soyarlar əynindən tacı-taxtını,*
*Yuyarlar, bükərlər ay aga səni.*

Araşdırıcı bu şeirin də haradan alındığını göstərməyib. Kiçik qüsurlarına baxmayaraq məqalə Qul Qaranı haqqında ilk məqalə kimi olduqca dəyərlidir.

### 2. Xəstə Hasan Qul Qaranı haqqında

Xəstə Hasanın yükcək sənətkarlıqla söylədiyi "Sözdə bir" divanisinin əlimizdə olan nüsxələrinin hamısında Qul Qaranının adı çəkilir. Aşağıda Türkiyənin Kars ilinin (vilayətinin) Kümbətli (Ladıkars) kəndindən olan Aşıq İslam Ərdənərdən topladığımız nümunəni veririk:

*Abi-çeşmim göllərində sona da bir, qaz da bir,*
*Süsən-sünbül, mor mənəvşə, bülbül ötər yazda bir.*
*Vaqif dərdən xəbərdardı Gövhərin qiyməti yox,*
*Qul Qaranı, Qara Zülal, Aşıq Ömər sözdə bir.*

Bu misralardan aydın görünür ki, Qul Qaranı Vaqif, Gövhəri, Aşıq Ömər, Qara Zülal kimi söz ustası sayılır. Aşiq İsgəndər Ağbabalı və Murtuza Tursunovdan (Namazov) topladıgımız nüsxələrdə isə son misra "Qul Qaranı qərəz eylər, Aşıq Ömər sözdə bir" kimidir. Fərqin yaranmasını aydınlaşdırmaq üşün mütləq Xəstə Hasanın Qul Qaranı ilə deyişməsindən söz açan dastan-rəvayəti gözdən keçirmək lazımdır.

### 2. Xəstə Hasan və Qaranının deyişməsindən bəhs edən dastan-rəvayət

Bir gecəlik məclis üçün hazırlanmış dastan-rəvayətin əlimizdə dörd nüxəsi var. Onlardan biri Məhəmməd Hüseynqulu oğlundan, ikincisi

Aşıq İsgəndər Ağbabalıdan, üçüncüsü Aşıq Murtazadan, dördüncüsü Aşıq İlyas Dadayevdən (Öncəki məqalələrimdə bu soyadını yanlış olaraq Dadaşov yazmışam – Ə.Ş.). Birinci nüsxəni araşdırıcı Elxan Məmmədli babasından toplayıb və AMEA Folklor İnstitutunun Arxivində 1996-cı ilin ekspedisya materialları sırasında 100-cü qovluqda saxlanılır. Sonrakı üc variant isə şəxsi arxivimizdə və AMEA Folklor İnstitunun arxivində müxtəlif illərin ekspedisya materialları arasındadır. Dördüncü variantı isə S.Peterburqda yaşayan professor Faiq Çələbi 9 iyul 1987-ci ildə Almatı şəhərində olarkən Aşıq İlyas Dadayevdən toplayıb.

Gözdən keçirdiyimiz dörd variantın sujetləri arasında elə bir ciddi fərq yoxdur. Hadisələr Nağı bəyin evində baş verir. Aşıq Murtaza və Aşıq İsgəndər Ağbabalı Nağı bəyin Qarzaxlı, Məhəmməd Hüseynqulu oğlu isə Sarıqamışlı olduğunu söyləyib.

Aşıq deyimələrinin ənənəvi qəlibləri əsasında qurulmuş dastan-rəvayətin qısa məzmunu belədir:

Qaranı Qarzaxlı Nağı bəyin aşığıdır. Nağı bəy təzə gətirdiyi gəlininə tərif dedirtmək istəyir. Bəyin xanımı gəlini bəzəyib məclisə gətirir. Qaranı gəlinə baxıb aşağıdakı tərifi deyir:

*Başına döndüyüm, qurvan olduğum,*
*Yoxdu sənin kimi, yaxası Gülgəz.*
*Alışıb oduna büryan olduğum,*
*Olarmı sənintək həvəsi Gülgəz.*

*Can qurban eylərəm o uca boya,*
*Gözəllik yaraşır qamətə, soya,*
*Bəzəkli-düzəkli aparam toya,*
*Yoxdur sənin təki sonası, Gülgəz.*

*Qaranıyam, oxumadım hecəmi,*
*Yuxum gəlmir, yatammıram gecəmi,*
*Çox gəzdim dünyanı, Azərbaycanı,*
*Öldürür qaşların qarası, Gülgəz.*

**(Ağbabalı İsgəndərin variantı)**

Aşıq Murtazanın və Aşıq İlyas Dadaşovun söylədiyi şeir də Ağbabalı İsgəndərdən toplanmış variantla məzmunca eyni olsa da, misralarda, deyimlərdə bir az fərq var. Hər iki şeir Gülgəz rədifi ilə bitir. Dastanda deyilir ki, şeir Nağı bəyin xoşuna gəlmir. O qədər hirslənir ki, hətta Qaranını öldürmək istəyir. Lakin dostları, məsləhətçiləri buna imkan vermir-

lər. Deyirlər ki, aşığı öldürsən deyəcəklər: "Nağı bəy bir aşığı da saxlaya bilmədi deyə öldürdü. Elə bir aşıq tapaq ki, deyişəndə onu bağlasın. Bu Qaranıya ölümdən ağır zərbə olar".

Şeiri diqqətlə gözdən keçirdikdə, burada elə bir qəbahətli misraya rast gəlmirik. Toylarda gəlinlərə, qızlara aşıqlarımızın əksəriyyəti belə tariflər deyib.

Burada nəsə bir anlaşılmazlıq, məntiqsizlik özünü göstərir. Elxan Məmmədlinin babası Məhəmməd Hüseynqulu oğlundan topladığı variantdakı gözəlin tərifi məsələyə aydınlıq gətirir.

*Gəl görüm, gəlişin nerdən, çeşmi siyah, nöycavan,*
*Həsrətəm didarına, çəkirəm ah nöycavan,*
*Nə müddətdir yolçusuyam, gözlərəm yollarını,*
*Axşamlar zarı qıllam, taki sabah nöycavan.*

*Bad əsdi, gül üzündən qalxdı niqab, ey nigar,*
*Dağıldı könlüm qübarı, hüsnünə qıldım nəzər,*
*Məni edib, məbus yaradıb, camalın pərvərdigar,*
*Saxlasın cümlə bəladan cəni Allah, nöycavan.*

*Qaranını mehman eylə otağına sazınan,*
*Üz sürtüb qədəmlərini bus edim peşvaznan.*
*Soyunub alsan qoynuna aşığı min nazınan,*
*Açılaydı üstümüzə taki sabah, nöycavan.*

Bu şeirin son misralarının Nağı bəyi və məclisdəkiləri əsəbiləşdirəcəyi, aşıqdan narazı salacağı normal görünür. Ehtimal etmək olar ki, Qul Qaranı Gülgəzin tərifinə iki şeir söyləmişdi. İkinci şeirdə açıq-saçıq, intim misralar olduğuna görə, onu qadınlar-qızlar, uşaqlar olan məclislərdə söyləməmişlər. Beləcə, bəzi aşıqların repertuarından çıxsa da, yaşlı nəslin yaddaşında qalmışdır.

Aşıq Murtaza variantında Qaranını qarşılaşdırmaq üçün Urfanini, Küfdadını və Usta Poladı dəvət etmək istəyirlər. Lakin onlar Qarzaxdan uzaqda olduğuna görə, gətirtmək vaxt aparır. Bu zaman eşidirlər ki, Xavet kəndində danaçılıq edən bir yeniyetməyə haqdan vergi verilib. Onu gətirtməyi planlaşdırırlar. Yeniyetmənin Qul Qaranı kimi bir aşıqla deyişməyə ehtiyat edəcəyini bilirlər. Buna görə də öncədən Nağı bəyin çağırdığını söyləyirlər.

Yeniyetmə Hasan Nağı bəyin yanına gələndə məclis qurulduğunu görür. Həmin vaxt bəyin göstərişi ilə Qaranı gizlənir. Bəy ona haqdan

vergi verildiyinin doğru, yalan olduğuyla bağlı suallar verir. Hasan söylənənlərin doğru olduğunu deyir. Nağı bəy deyir ki, doğrudursa, onda məclisdəkilər üçün çalıb-oxusun.

Xəstə Hasan çalıb-oxumağa başlayır. Aşıq Murtuzanın və Aşıq İsgəndər Ağbabalının, Aşıq İlyas Dadayevin söylədikləri variantda Xəstə Həsən müxtəlif məzmunda 3 şeir deyir ki, bunlar Məhəmməd Hüseynqulu oğlu variantında yoxdur. Dastan rəvayətin əsasını, özəyini təşkil edən Qul Qaranıyla Xəstə Hasanın deyişməsidir. Hər dörd variantda və Aşıq İslam Ərdənərin bizə göndərdiyi "Qara hey!" rədifli deyişmələr, misra, ifadə fərqlərini nəzərə almasaq, eynidir. Buna görə də onlardan Aşıq İslam Ərdənərin söylədiyi "Qara hey!" cığalı təcnisini, Aşıq İsgəndər Ağbabalının söylədiyi "Bax" divanisini, Məhəmməd Hüseynqulu oğlunun söylədiyi "Ver xəbər" divanisini təqdim edirik:

**Qul Qaranı:**

Əlif-bey içində, hərf arasında,
Bir xət gördüm, çəkilibdi qara hey!

Əziziyəm, qara hey!
Qış gəldi bax, qara hey.
Qaradan boyax olmaz,
Boyanıbdı qara, hey!

Namərd seyraqubun bafası olmaz,
Dolanar dünyanı üzü qara hey!

**Xəstə Hasan:**

Aləm bilir bu dünya da beş gündü,
Mən bilirəm beşini də qara hey!

Əziziyəm qara, hey!
Oxu dərsin qara, hey!
Əzəlindən kim çalıb,
Ağ üstündən qara hey?!

Sağlıq xəbərimi yara versələr,
Dost sevinər, düşmən geyər qara hey!

**Qul Qaranı:**

Üstümüzdə kərəm kanı bir dura,
Dəvət eylə, dostun minsin bir dura.

Əziziyəm, bir dura.
Bir yeriyə, bir dura.
Sərraf odur, dür seçə,
Qiymət vura bir dura.

Əliyyən Mürtəza mindi bir dura,
Qabağında sarvanıydı Qara hey!

**Xəstə Hasan:**

Xəstə düşdüm, döşək üstə dər saldım,
Cəfa çəkdim, dünya üçün dər saldım.

Əziziyəm, dərs aldım,
Eşiyinə dər saldım.
Eşitdim seyraqub gəlir,
Onun üçün dər saldım.

Əqli kamil ustadımdan dərs aldım,
Oxumuşam əlif, əbcət, qara hey!

**Qul Qaranı:**

Haqq əmr etdi inli-cinni yaransın,
Əyyub sağlığında gördü yarasın.

Əziziyəm, yarı sin.
Yarı mimdi, yarı sin.
Cismimi ataş aldı,
Qırağında yar, isin.

Qaranı der: Şavatçıyam, ya Rəsul.
Cünahkarlar gələr üzü qara hey!

**Xəstə Hasan:**

Bizlərdə qaydadı, yara deməzlər,
Yarın sirrin əğyara deməzlər.

Əzizyəm, yara deməzlər,
Yarı yara deməzlər.
Axır həsrət ölərəm,
Dərdi yara deməzlər.

Xəstənin dərdini yara deməzlər,
Görər məzarımı, geyər qara hey!

**(Aşıq İslam Ərdənər variantı)**

**Qul Qaranı:**

Ey könül, oyan qəflətdən, ol dəmi-dövrana bax,
Hər sabah tezdən ərşə çəkilən ol karvana bax.
Dəryada mah, yerdə murğu, hamı onun əmrindədi,
Dünya heç kəsə qalmadı, hanı, Süleymana bax.

**Xəstə Hasan:**

Bizi yoxdan var eyləyən ol Tanrı sübhana bax,
Abı, ataş, xaki, baddan xəlq olan insana bax.
Adəmi sakin eylədi cənnəti İrizvana,
Onların qəsdi-qərəzi ol ləin şeytana bax.

**Qul Qaranı:**

İbrahim ki, İsmayılı apardı Ərəfətə,
Dedi: Ata, qolum bağla, sallam səni əzyətə.
Xışmla bıçağı çəkdi ol Həcərül Əsfətə,
Kim göndərdi, kim gətirdi ol qoçu qurbana bax!

**Xəstə Hasan:**

Hax taladan nida gəldi, “İncil” endi İsaya,
“Zabur” Davuda verildi, abu “Tövrat” Musaya.
Məhəmməd durdu qıvlaya, Məryəm girdi kilisaya,
Məhəmmədin hümmətinə oxunan Qurana bax!

**(Aşıq İsgəndər Ağbabalı variantı)**

**Qul Qaranı:**

Bizi yoxdan var eyləyən ol sübhandan ver xəbər,
Səkkiz cənnət əzizi o kimlərdən ver xəbər.
O kimdi, hüllə biçir insanın sifətinə?
Doqquz bağa su bağlayan o bağmandan ver xəbər.

**Xəstə Hasan:**

Bizi yoxdan var eyləyən ol sübhandan al xəbər,
Səkkiz cənnət əzizi o kimlərdən al xəbər.
İdrisdir, hüllə biçir insanın sifətinə,
Doqquz bağa su bağlayan o bağmandan al xəbər.

**Qul Qaranı:**

Dinlərdən hansı əzizdi, mən tutmuşam adını?
Əngiddə kimlər gördü Əzrayılın cəngini?
O kim idi, iki yol gördü ana rəhnini?
Məkanı bu məkanın bil, o bir cannan ver xəbər?

**Xəstə Hasan:**

Məhəmmədin dini əzizdi, mən tutmuşam o dini,
Qabil öldürdü Habili, gördü Əzrailin zəhmini.
Həzrət Yunus iki yol gördü ana rəhnini,
Məkanı ümman məkanı, ol cannan al xəbər.

**Qul Qaranı:**

Qaranı ana ilə buldu bir-birini.??????
O kimiydi, kəndi əliynən kəndi kəsdi sərini?
O kim idi, atasız gəldi dünyaya, əmdi ana şirini?
O ki nədən xəlq olubdu, ol divandan ver xəbər?

**Xəstə Hasan:**

Xəstə Hasan ana ilə buldu bir-birini,
Əzraildir, kəndi əliynən kəndi kəsər sərini.
Həzrət İsa atasız gəldi, əmdi ana şirini,
O ki, nurdan xəlq olunub ol divandan ol xəbər.

**(Məhəmməd Hüseynqulu oğlu variantı)**

Qul Qaranının dediklərinə cavab verdikdən sonra Nağı bəy Xəstə Hasana təklif edir ki, indi də o desin. Xasta Hasan "İçində" rədifli bağlamanı deyir. Qul Qaranı bağlamanı aça bilmir. Xasta Hasanın söylədiyi bağlama Məhəmməd Hüseynqulu oğlu variantında yoxdur. Onun söylədiyi nisbətən yığcamdır və Qul Qaranının söylədiyi bağlamaları Xəstə Hasanın açmasıyla bitir.

Qalan üç variantda fərqlər azdır. Aşıq Murtaza variantının sonunda Qul Qaranı Nağı bəydən xahiş edir ki, Xəstə Hasanı ona iki günlük qonaq versin. Qul Qaranı uşağı, yəni Xəstə Hasanı incitdiyinə görə onun xəcalətindən çıxsın, könlünü alsın. "Nağı bəy dedi: "Yox olmaz, çünki insan oğlu çiy süd əmmiş". Qaranı dedi: "Bəqim, gətir əl kağızı yazem, mənim buna ziyanım olmaz". Nağı bəy dedi: "Onda olar, yaz. Əgər buna bir şey olsa, sənin kökünü kəsərəm, vallah!"

Bəli, Qur Qaranı Xəstə Hasanı apardı davata, hamısı yedilər işdilər... Nağı bəy bir yaxşı atı Xasta Hasana peşkaş verdi".

Bu sonluqda məğlub qalibdən düşmən kimi deyil, dostcasına ayrılır.

**Sonuc**

Gözdən keçirdiyimiz dastan-rəvayətlərdə və yazılı qaynaqlardan aşağıdakı nəticəyə gəlirik:

1. Qul Qaranı Türkiyədəki Ardahan qəsəbəsi yaxınlığındakı Dəyirman köyündəndir.

2. Aşığın əlimizdə olan 3 qoşma və 3 bağlamasından aydın görünür ki, ustad sənətkar olmuş, elə buna görə də bölgənin ən seçilən aşığı kimi Nağı bəy onu yanında saxlamışdır.

3. Şeirlərinin təsəvvüflə sıx bağlılığı, adındakı qul və Qaranı sözləri onun təriqətlə bağlı olduğunu söyləməyə əsas verir.

4. Qul Qaranı, Urfanı (əsil adı Süleyman), Usta Polad, Xəsta Hasandan yaşda böyük olsalar da, bir bölgənin sənətkarlarıdır və çağdaşdırlar.

5. Aşıq Şenlik 1853-1914-cü, Aşıq Nuru 1811-1885-ci, Xəstə Həsən 18-19-cu yüzillərdə yaşayıblar. Bu hesabla Qul Qaranı da Xəstə Hasandan 20 yaşdan çox büyük olmalıdır. Deməк Qaranının doğum tarixi 18-ci yüzilin ikinci yarısına düşür.

6. Xəstə Hasan Qul Qaranı ilə deyişib. Bu mövzudakı dastan-rəvayət isə sonradan, özü də Xəstə Həsənin şagirdləri tərəfindən formalaşdırılıb. Buna görə də Xəstə Hasanın "Birdir, bir" divanisindəki "Qul Qaranı, Qara Zülal, Aşıq Ömər sözdə bir" misrası dastan sujetinin təsirilə "Qul Qaranı qərəz eylər, Aşığ Ömər sözdə bir" şəklinə salınıb. Beləliklə, aşıqların şerlərinin qorunub günümüzədək gəlib çatmasında böyük rolu olmuş "Qul Qaranıynan Xəstə Hasanın deyişməsi" dastan-rəvayət həm də Qara Zülal kimi aşığımızın unudulmasına, Qul Qaranı kimi ustadın qərəzkar kimi tanınmasına şərait yaradıb.

7. Şeir və rəvayətlər isə onu göstərir ki, Xəstə Hasan Qul Qaranının ya şagirdli olub, ya da ondan güclü təsirlənib.

Bakıdakı Atatürk Mərkəzinin şöbə müdiri, üzrə kimya fəlsəfə doktoru Nazir Əhmədli aşıqlarımızın doğum tarixinin öyrənilməsində yeni cığır açdı. O, İrəvan xanlığına daxil olan Dərələyəz və Göyçə mahallarının kameral dəftərlərini yayınlamaqla qalmadı, "Haq nahaq seçilər haqq divanında" adlı bir kitab da yazdı. Bu kitabda indiyədək doğum tarixləri yanlış verilmiş Ağ Aşıq ləqəbli Allahverdinin, Aşıq Alının, Açıq Ələsgərin, Aşıq Musanın, Daşkəndli Şair Məmmədhüseynin, Şəmkirli Söyünün, Kosacanlı Aşıq Allahverdi baba oğlunun doğum tarixlərini kameral dəftərlər əsasında müəyyənləşdirdi. Bununla kifayətlənmədi, sonrakı məqalələrində Sallı Aşıq Cəlilin, Şişqayalı Aydının və b. doğum tarixini dəqiqləşdirdi.(Əhmədli Nazir, 2017)

Bu, araşdırmaçılarımıza imkan verir ki, istər Türkiyədə, istər Azərbaycanda olsun təhrir və kameral dəftərlərdən yararlanaraq aşıqlarımızın və b. insanlarımızın doğum tarixini dəqiqləşdirmək olar.

## Qaynaqlar:


1. **Alptekin Ali Berat**. (2007). Çıldırlı Aşık Şenlik bibliyografyası. Ankara.
2. **Aslan Enser**. (1975, 1993), Çıldırlı Aşık Şenlik. Hayatı, şiirléri vé hikayéléri. (İncélémé-métin-sözlük), Ankara.
3. **Aşıkoğlu İsmail. (**1964), Aşık Şenlik, "Koban" yayınları, İzmir.
4. **Çıldırlı Aşık Şenlik**. (2006). Divanı.(Hayatı, şiirlerı, atışmaları ve hikayeleri), Hazırlayanlar: A.Barat Alptekin, M.Nizamettin Coşkun, Ankara.
5. **Erdener Aşık İslam.** (1960), Aşık Şenlik divanı, "Bugün" matbaası, Kars. 5.
6. **Əhmədli Nazir.** (2017). Haqq-nahaq seçilər Haqq divanında, "Nurlar" Nəşriyyat-Poliqrafiya Mərkəzi, Bakı.
7. **Əhmədli Nazir.** (2017). Göyçə mahalının kameral təsviri (1831-ci və 1842-ci il), "Elm və təhsil" nəşriyyatı, Bakı.
8. **Hacılar Valeh.** (2005), Gürcistanda Türk xalk ədəbiyyatı ənənənləri. «Səda» nəşriyyatı, Bakı.
9. **Hacıyev V**. (1983), Xəstə Hasan kimdir? "Sovet Gürcüstanı" qəzeti, 12 aprel.
10. **Hacıyev Valeh.** (1991), Folklorumuzun üfüqləri. (Azərbaycan-Gürcistan folklor əlaqələri tarixindən). "Yazıcı" nəşriyyatı, Bakı.
11. **Qarapapaq Şurəddin Məmmədli.** (2000), Borçalı ədəbi mühitü, "Elm" nəşriyyatı, Bakı.
12. **Qarapapaq Şurəddin Məmmədli** (2004). Borçalı-Ahıska-Kars ortaq ədəbi arealı, "Kolori" nəşriyyatı, Tbilisi.
13. **Kars ili.** (1966), Çıldır, Ardahan, Hanak, Posof. I sayı. Özél say. Kars Turizm vé Tanıtma dérnéği yayınları. Sayı 5, Ankara.
14. **Özbék Orhan.** (1969), "Aşık Şenlik.(değişmélér, karşılaştırmalar), "Ay yıldız" néşriyatı, Ankara.
15. **Şamil Ali.** (2004), Xəstə Hasanın ömür yoluna dair bir dəqiqləşdirmə. "Ortak Türk keçmişindən ortak Türk gələcəyinə". II Uluslararası Folklor Konfransı. AMEA Folklor Mərkəzinin nəşri, Bakı.
16. **Şamil Ali.** (2006), Aşiq Ürfaninin ömür yolu və şeirləri. "Ortaq türk keçmişindən ortaq türk gələcəyinə». IV Uluslararası Folklor Konfransının materialları. AMEA Follkor İnstitutu, Bakı, 1-3 noyabr, s.85-91.
17. **Şamilov Ali.** (1984), El sənətkarlarımız. Xəstə Hasan, "Şərq qapısı" qəzeti, 20 Mart, Naxçıvan.
18. **Şamilov Ali.** (1986), Xəstə Hasan və müasirləri. "Sovet Gürcüstanı" qəzeti, 1 iyul, Tbilisi.
19. **Şamil Əli.** (2012).Axısqalı Xəstə Hasan (şeirləri və şeirlərinin yaranması haqqında söhbətlər)**, "**Elm və təhsil" nəşriyyatı, Bakı.
20. **Şamil Əli.** (2016). Çıldırlı Aşıq İrfani, **"**Elm və təhsil" nəşriyyatı, Bakı.



**Araz YAQUBOĞLU**
**tədqiqatçı**

# GÖYÇƏNİN SAZ-SÖZ USTADLARI İKİNCİ DÜNYA MÜHARİBƏSİNDƏ

Bəzən yerli-yersiz sual olunur: Göyçədən nə qədər danışmaq, nə qədər yazmaq olar? Bir neçə dəfə suala belə cavab vermişəm: nə qədər ki, bədii ədəbiyyatın əbədi mövzusu məhəbbət var, o qədər də Göyçə mövzu olaraq qalacaq. Göyçənin tarixi, folkloru, ədəbiyyatı, şəxsiyyətləri o qədər zəngin və əhatəlidir ki, onlardan cild-cild kitablar yazılsa belə, bitib-tükənən deyil. Göyçədə saza, sözə o qədər sevgi olub ki, saz-söz sənətkarları elin nəzərində ən böyük, ən hörmətli şəxs hesab olunmuşlar. Hətta saz insanlar üçün and yerinə çevirilib. Haqlı olaraq filologiya üzrə fəlsəfə doktoru Ziyəddin Məhərrəmov yazır: "Göyçədə saza-sözə hədsiz bağlılıq və qeyri-adi həssaslıq mövcud olduğundan hər əlinə saz götürən burada özünü sənətkar elan etməyə cəsarət etməmişdir. Saz çalmağı, söz oxumağı bu eldə uşaqdan-böyüyə hamı bacarmışdır. Saza-sözə toydan-toya, məclisdən-məclisə deyil, demək olar ki, hər gün müraciət olunmuş, üz tutulmuşdur. Saz-söz, poeziya göyçəlinin gündəlik həyatının ayrılmaz tərkib hissəsinə çevrilmişdir. O, çöldə-bayırda iş görəndə, əkin-biçinlə, bağ-bağatla, qoyun-quzu bəsləməklə məşğul olanda da, nəfəs dərib dost-tanışla, yar-yoldaşla əhvallaşanda da, evdə oğul-uşağa öyüd-örnək verəndə də dilində-könlündə şeir gəzdirib-dolaşdırmışdır" [1,s.125]. Ona görə də Göyçədən daim yazılmış, yazılır və bundan sonra da yazılacaq.

Göyçə aşıq mühitinin ünlü sənətkarları zaman-zaman tədqiqat obyekti olmuşdur. Bu araşdırmalar 1988-ci il hadisələrindən sonra daha da geniş vüsət almış, aşıq və şairlər ayrı-ayrılıqda və ya ümumi şəkildə araşdırılmışdır. Tərlan Göyçəli "Göyçə aşıq məktəbi" kitabının girişində yazır: "Göyçə aşıq məktəbinin öyrənilməsi, araşdırılması, elmi şərhi indiki ictimai-siyasi şəraitdə günün ən vacib məsələlərindən biridir"[2,s.7]. Bəli, düşmənlərimizlə hərbi-siyasi müstəvidə mübarizədən əlavə, ədəbi-tarixi yöndə də mübarizə aparmalıyıq. Dediklərimiz tarixi yurdlarımıza qayıtmağın çoxsaylı yollarından biridir. "Keçmişini bilməyən gələcəyini qura bilməz" – deyən filosoflar heç də yanılmayıblar.

"Göyçənin saz-söz ustadları İkinci dünya müharibəsində" mövzusu məni çoxdan ayrıldığım araşdırmalarıma qaytardı.

Göyçə kəndlərinin hər birindən neçə-neçə igid oğullar qanlı-qadalı İkinci dünya müharibəsinə yollanmış, onların demək olar ki, yarısı geri qayıtmamışdır.

Aralarında heç şübhəsiz ki, xeyli aşıq və şairlər də var idi. Aşıq Müseyib, Ağkilsəli Aşıq Nəcəf, Aşıq Əli Rəsulov, Aşıq Niftalı, Aşıq Məhərrəm Hacıyev, Aşıq Rəcəb, Aşıq Qəmbər, Aşıq Abbasəli Xəlilov, Aşıq Abbasəli Nəzərov, Aşıq Cahad, Aşıq Musa Həsənov, şairlərdən Həsən Xəyallı, Xəstə Bayraməli, Şair Həşim, Qəmgin Fəzi, Əli Coşqun, Qəşəm Kərimov, İsmayıl Hüseynov, Coşqun Ağababa, Firudin Məmmədov və başqaları müharibə veteranı kimi doğma yurda dönə bilmişlər. Araşdırıb məlumat toplaya bildiyim Şair Aqil, İsoy Qurbanov, Aşıq İdris, Şair Əbülfət, Aşıq İslam Yarpızlı, Aşıq Ziyad, Qul Yunus, Aşıq Əli Şairov, Muxayıl Göyçəli, Aşıq Süleyman və Aşıq Səfiyar haqqında oxuculara məlumat verməyə çalışacağam.

İslam Ələsgərin "Sazlı-sözlü Göyçə" kitabında müharibədən doğma yurda dönə bilməyən saz-söz bahadırları haqqında oxuyuruq: ""Böyük Vətən müharibəsi" adlandırılan 1941-1945-ci il müharibəsi zamanı cəbhəyə yollanan Göyçə oğulları, o cümlədən gənc aşıqlar öz canları, qanları bahasına Vətəni düşməndən təmizləməkdə fəal iştirak elədilər. Onların bir çoxu həlak oldu, doğma yurda qayıda bilmədi; öz əllərilə divardan asdıqları saz müharibədən sonra da uzun müddət sahibinin yolunu gözlədi" [3,s.13].

Ümumiyyətlə, İkinci dünya müharibəsində iştirak edən aşıq və şairlərin həyat və yaradıcılığı haqqında tədqiqatçılardan Ziyəddin Məhərrəmov, Tərlan Göyçəli, İslam Ələsgər, professor Qara Namazov və bu sətirlərin müəllifinin araşdırmalarına rast gəlinir. Lakin yazılanlar bəzi yanlışlıqlardan da xali deyil. Belə ki, bizim "obd-memorial.ru" saytından əldə etdiyimiz rəsmi sənədlər aşıq və şairlərin doğum və vəfat tarixlərini dəqiqləşdirməyə imkan verdi.



**Şair Aqil.** Qafarov Niftalı Qafar oğlu 1900-cü ildə doğulmuşdur. 5 yanvar 1941-ci ildə Gədəbəy RHK-dan orduya çağırılmışdır. Niftalı Qafarov haqqında 3 oktyabr 1943-cü il tarixdən heç bir məlumat olmamış və 1944-cü ilin yanvar ayından itkin düşmüş hesab edilmişdir. Sənəddə onun Gədəbəy rayonunun İvanovka kəndində yaşamış olduğu da göstərilir. [4, 64989709]

Ziyəddin Məhərrəmov şair Niftalı Qafarovun 1943-cü ildə Ukraynada döyüşdə, [5,s.38] Tərlan Göyçəli isə şairin 1943-cü ilin noyabrında Cənubi Ukrayna cəbhəsində qəhrəmancasına həlak olduğunu yazmışdır. [2,s.113]

O, ilk təhsilini həmkəndlisi Məşədi Molla Əlinin açdığı mollaxanada almışdır. Sovet hakimiyyəti illərində Leninakan (Gümrü) Pedaqoji Texnikumunu bitirən Niftalı 1923-cü ildə öz kəndlərində müəllimliyə başlamışdır. [3,s.195]

Aqil 1937-ci ilin yazında doğma kəndi Ağbulaqdan Azərbaycanın Gədəbəy rayonunun Ağkilsə (indiki İvanovka) kəndinə köçüb. 1939-cu ildə Bakıda keçirilmiş el ədəbiyyatı nümayəndələrinin müşavirəsində uğurla

iştirak etmiş və böyük şairimiz Səməd Vurğunun təqdimatı ilə Yazıçılar İttifaqının üzvlüyünə qəbul edilmişdir. [2,s.112-113]

O, şeirlərini Aqil təxəllüsü ilə yazmışdır. Şair Kazımın bacısı oğludur. İvanovka kəndində yaşamış, İnəkboğan kəndində müəllim işləmişdir. [5,s.38]

Onun müxtəlif şəkilli şeirləri aşıqlarımızın repertuarında özünə yer tutmuşdur. İ.Ələsgər onun şeirlərini şairin yaxın qohumu olan Aşıq Məhərrəm Hacıyevin hafizəsindən qələmə almış, “Yaraşır”, “Oynasın”, “Üç sözüm var, gərək dosta deyəsən”, “Gəlmişdi”, “Bu gün bir qız gördüm, hazar eylədim” rədifli qoşmalarını, “Gəlin” rədifli gəraylısını, “Xoruzu”, “Gözəl”, “Xəngəlin”, “Elədi” rədifli müxəmməslərini çap etdirmişdir. [3,s.195-203]

T.Göyçəli şairin “Hiyləgər dünya...”, “Düşübdü”, “Gəlmişdi” qoşmalarını, “Eylədi” müxəmməsini, “Minə, minə” təcnisini, [2,s.113-116] professor Q.Namazov isə şairin “Oynasın” rədifli qoşmasını çap etdirmişdir. [6,s.381-382]

Mənbələrdə şairin təvəllüdü ilə bağlı qeyri-dəqiqlik mövcuddur. Tərlan Göyçəli şairin 1885-ci ildə [2,s.112], Qara Namazov 1895-ci ildə [6,s.380], Ziyəddin Məhərrəmov 1898-ci ildə, [5,s.38] Musa Nəbioğlu 1899-cu ildə [7,s.35], İslam Ələsgər isə 1907-ci ildə [3,s.195] doğulduğunu yazmışlar.



**İsoy Qurbanov.** Qurbanov İsoy Nəcəf oğlu 1902-ci ildə Daşkənd kəndində doğulmuşdur. İsoy Qurbanov 269-cu atıcı dviziyasının qızıl əsgəri olmuşdur. 14 may 1942-ci ildə Orlov vilayəti Novosil rayonunun Odinok kəndindəki döyüşdə həlak olmuş, həmin rayonun İqumnovo kəndində dəfn edilmişdir. Sənəddə İsoy Qurbanovun Ruqiyə Məhəmmədəli qızı ilə ailəli olduğu da qeyd edilib. [4, 51631064]

İsoy Qurbanovun həyat və yaradıcılığı haqqında ilk dəfə məlumat “Daşkənd aşıqları və şairləri” kitabında çap olunmuşdur. Rəsmi sənədlərə əsasən verilən yuxarıdakı məlumatlar bu kitabın çapından sonra əldə edildiyindən, doğum və vəfat tarixləri doğmalarının söyləmələrinə əsasən yazıldığına görə yanlışlıq olmuşdur. Kitabda məlumat olduğu kimi belədir:

“Qurbanov İsoy Nəcəf oğlu, 1907-ci ildə Qərbi Azərbaycanın Göyçə mahalının Daşkənd kəndində anadan olmuşdur.

Deyilənlərə görə, İsoy lap uşaqlıqdan ustadların şeirlərini söyləyər və özü də şeirlər qoşarmış. Bir neçə şeirlərinin möhürbəndində “Yetim İsoy” təxəllüsü də işlətmişdir.

İsoy Qurbanov 1941-1945-ci illər Böyük Vətən Müharibəsi zamanı 1943-cü ildə müharibəyə səfərbər olunmuş və 1944-cü ildə Böyük Vətən Müharibəsində qəhrəmancasına həlak olmuşdur.

İsoyun Tutu, Ballı, Mürəbbə və Minayə adlı dörd qızı və Lətif adlı bir oğlu olmuşdur. İsoy müharibədə olarkən yeganə oğlu Lətif vəfat etmişdir.

İsoy Qurbanovun şair olduğunu və müxtəlif səpkili şeirlər yazdığını onu görən bir çox daşkəndlilər təsdiq edirlər. Təəssüflər olsun ki, İsoyun tam yaradıcılığını hələ ki, əldə etmək mümkün olmamışdır.

İsoyun bir neçə şeirləri onun qızları və nəvələrindən əldə olunmuş cəbhə məktublarından və Xasay Zeynalovdan götürülmüşdür. Əldə olunan "Eylə", "Oldumu" və "Qaldım" rədifli qoşmaları isə həmkəndlisi Muxayıl Budaqoğlunun 1943-cü ilə aid əlyazmasından götürülmüşdür. Əlyazma hal-hazırda Yeni Daşkənd kəndində yaşayan Məsimov Oruc Budaq oğlu tərəfindən qorunub, saxlanılır." [8,s.43]

"Daşkənd aşıqları və şairləri" kitabında İsoy Qurbanovun "Göyçə", "Saxlayın", "Məni" rədifli gəraylıları və "Qızım", "Eylə", "Oldumu", "Bilin", "Məni", "Minayə qızım", "Qaldım", "Amandı", "Lətifim mənim", "Mənim" rədifli qoşmaları çap olunmuşdur. [8,s.44-51] Kitabdakı cəmi 13 şeirdə 49 bənd bu günə qədər əldə olunanlardır. Həmkəndlisi və qohumu Abdulla Hümbətovun söylədiyinə görə, İsoy Qurbanovun onda olan 50 qatar şeirinin yazıldığı dəftər kənd əhalisinin 1953-cü ildəki köçürülməsində itmişdir.



**Aşıq İdris:** Məhərrəmov İdris Şirin oğlu 1905-ci ildə Zərkənd kəndində doğulmuşdur. 28 avqust 1942-ci ildə Basarkeçər RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər İdris Məhərrəmov 1943-cü ilin avqust ayında itkin düşmüşdür. [4, 67794588] İstinad etdiyimiz sayt-dakı digər bir sənəddə onun 1943-cü ilin may ayında itkin düşdüyü qeyd edilib. [4, 87569214]

İdris aşıqlıq sənətinə erkən yaşlarından maraq göstərib, 12 yaşında ikən atası Aşıq Şirindən dərs almağa başlayıb. 80-dən artıq saz havasını bacarıqla ifa edirmiş. Otuz beş dastanı sinədən bilmiş, ağır yığnaqlar keçirmişdir. [9]

1938-1941-ci illərdə Basarkeçər rayonunda aşıqlara rəhbərlik edib. Azərbaycan aşıqlarının I və II qurultaylarının nümayəndəsi olub. 1938-ci ildə İncəsənət xadimi fəxri adına layiq görülüb. Vala köçürülmüş mahnıları vardı. [7,s.25]

2003-cü ildə Aşıq İdrisin və atası Aşıq Şirinin həyat və yaradıcılığından bəhs edən "Göyçə aşıqları: Aşıq Şirin Aşıq İdris" adlı kitab "Nurlan" nəşriyyatında çap olunmuşdur.

Aşıq İdris Zərnişan Xankişi qızı ilə ailə həyatı qurmuş, Maral adlı bir qızı, Şəmdin, Xasay, Surxay, Bahadur, Qəzənfər, Məmməd adlı 6 oğlu olmuşdur. Qızı Maral atasının qara xəbərini eşitdikdə, bu acı xəbərə dözməyib 12 yaşında vəfat edib. [10]

Mənbələrdə aşığın təvəllüdü ilə bağlı qeyri-dəqiqlik mövcuddur. Aşıq Şəmşir və Musa Nəbioğlu aşığın 1894-cü ildə, [9; 7,s.25] Qara Namazov isə 1903-cü ildə [6,s.199] doğulduğunu yazmışlar.

**Şair Əbülfət.** Rəhimov Əbülfət İsmayıl oğlu 1905-ci ildə Zod kəndində doğulmuşdur. 3 dekabr 1942-ci ildə Basarkeçər RHK-dan orduya çağırılmış-dır. 269-cu atıcı diviziyasının 1022-ci atıcı alayının əsgəri olmuşdur. 24 iyun 1944-cü ildə Belorusiya SSR-in Qomel vilayətinin Roqaçevski rayonunun

Viriçev kəndindəki döyüşdə həlak olmuş, kəndin yüksəkliyi 144,5 metr olan şimal-qərb tərəfindəki yamacda dəfn olunmuşdur. [4, 9434559]



İstinad etdiyimiz saytdakı digər sənəddə qeyd olunur ki, Rəhimov Əbülfət İsmayıl oğlu 1905-ci ildə doğulmuşdur. 24 iyun 1944-cü ildə Belorusiya SSR-in Qomel vilayətinin Roqaçevski rayonunun Viriçev kəndində döyüşdə həlak olmuş, Tixiniçi kəndindəki qardaşlıq qəbiristanlığında dəfn edilmişdir. [4, 261793473]

Digər bir sənəddə əlavə olaraq yazılır: Rəhimov Əbülfət İsmayıl oğlu 3-cü Ordunun 269-cu atıcı dvizyasının 1022-ci atıcı alayının əsgəri olmuşdur. [4, 9436601]

İrəvan Pedaqoji Texnikumunu bitirən Əbülfət öz kəndlərindəki orta məktəbdə dil-ədəbiyyat müəllimi kimi fəaliyyətə başlamışdır. O, erkən bədii yaradıcılığa meyl göstərmiş, xalq arasında şair kimi tanınmışdır. Ermənistan Yazıçılar İttifaqı Azərbaycan bölməsinin katibi olan Əbülfət, eyni zamanda SSRİ Yazıçıları İttifaqının üzvü idi. [3, s. 221]

O, Mirzə Bəylərin qız nəvəsi, Usta Abdullanın isə qardaşı oğludur. ...Əbülfətin zamana güzgü tutan uğurlu şeirləri vaxtilə Göyçədə çıxan “Qızıl Basarkeçər”, Yerevanda nəşr olunan “Qızıl şəfəq” qəzetlərinin səhifələrində və bir sıra almanaxlarda dərc edilmişdir. [2, s.176-179]

Əbülfət Rəhimovun 1933-cü ildə Yerevandakı “Ermən-nəşr” nəşriyyatında köhnə latın qrafikası ilə “Din əleyhinə”, 1985-ci ildə isə Bakıdakı “Yazıçı” nəşriyyatında kiril qrafikası ilə “Axan ulduzun işığı” adlı şeirlər kitabı çap olunub.

Tərlan Göyçəli şairin “Dünya”, “Gəlsin”, “Qəm yemə”, “Aman günüdü”, “Hardasan” rədifli qoşmalarını, [2, s.177-181] İslam Ələsgər isə “Ağlama”, “Aman günüdü”, “Durma, gəl”, “Əzizim”, “İnşallah” rədifli qoşmalarını, “Bülbül”, “Ey fələk”, “Külək, məndən xəbər apar”, “Mənim”, “Olaydı” rədifli gəraylılarını, “Güldü, nə güldü”, “Nə saqisən, yar” rədifli təcnislərini, “Üstədi”, “Ey əmi” rədifli divanilərini çap etdirmişdir. [3,s.221-229]

Şair Əbülfət Fatma xanımla ailə həyatı qurmuş, Həsən adlı övladı olmuşdur.

Mənbələrdə şairin təvəllüdü ilə bağlı qeyri-dəqiqlik mövcuddur. Qara Namazov şairin 1908-ci ildə, [6,s.115] Tərlan Göyçəli və İslam Ələsgər isə şairin 1914-cü ildə doğulduğunu yazmışlar. [2,s.176; 3,s.221]

**Aşıq İslam Yarpızlı:** Əmirzadayev İslam Məhəmmədəli oğlu Lçavan kəndində doğulmuşdur. Sıravi İslam Əmirzadayev 1943-cü ilin may ayında itkin düşmüşdür. [4, 87480424] İstinad etdiyimiz saytdakı digər bir sənəddə Əmirzadayev İslam Məhəmmədəli oğlunun Yarpızlı kəndində doğulduğu və ən geci 24 may 1943-cü ildə itkin düşdüyü qeyd edilmişdir. [4, 87570607] Yeri gəlmişkən, onu da qeyd etmək lazımdır ki, Yarpızlı kəndinin adı Ermə-

nistan SSR Ali Soveti Rəyasət Heyətinin 25 may 1967-ci il tarixli fərmanı ilə dəyişdirilib Lçavan qoyulmuşdur. [11,s.347-348]

Bu sətirlərin müəllifinin 2011-ci ildə "Filologiya məsələləri" elmi jurnalında nəşr olunan məqaləsindən (ixtisarla): "Əmirzadayev İslam Məhəmmədəli oğlu (Aşıq İslam) 1910-cu ildə Göyçə mahalının Basarkeçər rayonunun Yarpızlı kəndində anadan olub. Anası Qaratel mahalın Daşkənd kəndində yaşamış Dərzilər nəslindən Məsimin qızı olmuşdur. 1943-cü ildə Aşıq İslam Böyük Vətən Müharibəsinə səfərbər olunmuş, İrana göndərilən hərbi hissənin tərkibində İrana getmiş və bir daha geri qayıtmamışdır.

Daşkəndli el şairi Muxayıl Göyçəli (1918-1944) Aşıq İslamın dayısı Budağın oğludur. Qeyd olunan qohumluq əlaqələrinə görə Aşıq İslam Daşkəndlə sıx təmasda olmuş, həftələrlə kənddə qalmış və toy məclisləri, el şənlikləri keçirmişdir. Elə bu səbəbdən də ustad aşıqlardan olan Aşıq İslam Yarpızlı Daşkənddən Aşıq Abbasəli Xəlilovun (1913-2007) və Aşıq Abbasəli Nəzərovun (1919-1992) ustadı olmuş, onların aşıq kimi yetişməsində əvəzsiz rol oynamışdır. Aşıq İslam Muxayıl Göyçəliyə də saz havalarını və ifaçılığı öyrətsə də, o aşıq kimi yox, daha çox el şairi kimi tanınmışdır.

Tam dəqiqləşdirilməmiş şəxsi araşdırmalarımıza görə Aşıq İslamın ustadı öz həmkəndlisi Yarpızlı Aşıq İman olmuşdur.

...Sazın-sözün vurğunu Daşkəndli Murtuz Bayramquliyevin (1926-2007) əlyazmalarında aşığın "Bəyənməz" və "Qurqalanmasın" rədifli qoşmaları, "Yox" rədifli divanisi, "Könül ilə İslamın deyişməsi" və Növrəs İmanla Aşıq İslamın "İbtida" (tərs əlifbey divani) rədifli deyişməsi olmaqla cəmi 5 şeir yazılmışdır. Daşkəndli el şairi Muxayıl Göyçəli ilə Aşıq İslamın 20 yanvar 1941-ci il tarixdə yaranan "Əzizim" rədifli deyişməsi isə ilk dəfə 2008-ci ildə bu sətirlərin müəllifinin "Daşkənd aşıqları və şairləri" adlı kitabında çap olunmuşdur. [8,s.84]

Aşıq İslam haqqında apardığımız araşdırmalar zamanı bizə yaxından köməklik edib, məlumatlandıran İslamın dayısı oğlu, Muxayılın kiçik qardaşı olan Oruc Məsimov (1926) oldu. Onun indiyə qədər qoruyub saxladığı qardaşı Muxayılın 1942-1943-cü illərə aid əlyazmaları köməyimizə çatdı. Demək olar ki, Aşıq İslamın xeyli şeirləri həmin əlyazmalarda toplanmışdır. Biz bu əlyazmaların surətini çıxarmış və 5 cilddə cildləmişik. Əlyazmalarda bir dastan da olmaqla Aşıq İslamın yaradıcılığına məxsus gəraylı, qoşma, təcnis, dodaqdəyməz, divani, müəxəmməs, qıfılbənd, nəzirə və deyişmələri öz əksini tapmışdır. Şeirlərin demək olar ki, hamısında Aşıq İslam təxəllüsünü Cavan İslam kimi möhürbənd etmişdir. Əlyazma cildlərdə təxminən şeirlər bu saydadır: 5-1-ci cilddə 1 dastan, 5-2-ci cilddə 55 bağlama və dodaqdəyməz, 5-3-cü cilddə 60 müxtəlif şeir, 5-5-ci cilddə 105 müxtəlif şeir, nəzirə və deyişmələr vardır (5-4-cü cilddə 57 şeir var, bu şeirlər Muxayılındır). Aşıq İslamın zəngin ədəbi irsi təəssüf ki, bu günə qədər toplanılıb çap olunmamışdır." [12, s. 350-354]

Aşıq İslam Yarpızlının "Yox", "Bağlıdı" rədifli divaniləri və "Əzizim" rədifli deyişməsi "Ozan dünyası" jurnalında çap olunmuşdur. [13, s. 60-61]

**Aşıq Ziyad:** Məmmədov Ziyad Nadir oğlu 1911-ci ildə Daşkənd kəndində doğulmuşdur. 1937-ci ildən ÜİLKGİ-nin üzvü olmuşdur. 1941-ci ilin sentyabr ayında Basarkeçər RHK-dan orduya çağırılmışdır. Baş çavuş Ziyad Məmmədov bölük komandiri olmuşdur. 30 iyun 1942-ci ildə Ukraynanın Sevastopol rayonu ərazisində əsir düşmüşdür. [4, 65722893]

İstinad etdiyimiz saytdakı digər bir sənəddə baş serjant Məmmədov Ziyad Nadir oğlunun 21-ci ehtiyat atıcı divizyanın 102-ci ehtiyat atıcı alayının (1-ci təlim batalyonu, 4-cü rota) bölük komandiri və atıcısı olduğu göstərilir. O, 1942-ci ildən Almaniyadakı "İmştrans" əsir düşərgəsində işləmişdir. Keçmiş hərbi əsir Ziyad Məmmədov 20 aprel 1945-ci ildə İtaliyanın Taranto şəhərindən Odessa şəhərindəki toplanış-yoxlama məntəqəsinə gətirilib. Qeydiyyat nömrəsi 9155 olmuşdur. *20 iyul 1945-ci ildə Tomsk stansiyasındakı Baş Təchizat İdarəsinin Çeromışşensk Kombinatı* (Kursivlə verilən cümlə sənədin "Getdiyi tarix və yer" bölməsinə sonradan əlavə edilib). Kartoçkanı 7 may 1945-ci ildə 4-cü rotanın komandiri, qvardiya baş leytenantı Osipov doldurmuş və imzalamışdır. [4, 85431906]

Aşıq Ziyad Göyçə mahalının Böyük Qaraqoyunlu kəndində doğulan, sonralar Tovuz rayonunda yaşayan Aşıq Əsədin (1874-1951) şəyirdi olmuşdur. [8,s.85] Aşıq Ziyad qısa bir müddətdə nəinki Daşkənddə, eləcə də Göyçə mahalında ustad aşıqlardan biri kimi tanınmış, toy məclislərinin, el şənliklərinin mütəmadi aparıcısı olmuşdur. O ifaçı aşıq olmaqla yanaşı, həm də yaradıcı aşıq olmuşdur. Təəssüf ki, hələ aşığın yaradıcılığını əldə edə bilməmişik. Nərimanlı Bəhmənlə deyişdiyini də deyənlər var. Aşıq Ziyad həmçinin Zərkəndli Aşıq İdris Məhərrəmovun sədri olduğu Basarkeçər aşıqlar təşkilatının üzvü olmuşdur.

Aşıq Ziyad ustadı Aşıq Əsədin qızı Sürayəni (Sura) sevmiş, qızı Daşkəndə qaçıraraq onunla ailə qurmuş, Zəhra və Turac adlı iki qızı olmuşdur. Aşıq Ziyadın nəvə-nəticələri hal-hazırda Tovuz rayonunda yaşayırlar.

Bu sətirlərin müəllifinin "Daşkənd aşıqları və şairləri" kitabında Aşıq Ziyadın 1917-ci ildə doğulduğu göstərilmişdir.[8,s.85] Yuxarıda rəsmi sənədlərə əsasən verilən məlumatlar bu kitabın çapından sonra əldə edildiyindən aşığın təvəllüdü qohumlarının söyləmələrinə əsasən yazıldığından yanlışlıq olmuşdur.

**Qul Yunus.** Abbasov Yunus Canbaxış oğlu 1912-ci ildə Zod kəndində doğulmuşdur. 1942-ci ildə Basarkeçər RHK-dan orduya çağırılmışdır. Sonuncu məktubu 160 saylı hərbi hissədən – 883-cü səhra poçtundan gəlmişdir. 1942-ci ilin iyul ayında itkin düşmüşdür. [4, 60956678]

İstinad etdiyimiz saytdakı digər iki sənəddə də sıravi Abbasov Yunus Canbaxış oğlunun Zod kəndində doğulduğu və 1942-ci ilin iyul ayında itkin düşdüyü qeyd edilmişdir. [4, 87481009, 87569512]

Professor Q.Namazov "Aşıqlar" kitabında yazır (ixtisarla): "Qul Yunus (1912-1943) Göyçə mahalının Zod kəndində doğulub. Dövründə təhsil alıb, müəllim sənətinə yiyələnib. Kənddə tanınmış ziyalılardan biri olub. Göyçə aşıq mühitini mükəmməl öyrənib. Aşıq şeirinin çeşid-çeşid şəkillərində lətif nümunələr yaradıb.



İstedadlı, gözəl saz şairi rus-alman savaşında ölüb. Onun ağızlarda bəzi şeirləri qalıb. Bu şeirlər göstərir ki, Qul Yunus saz şeirinə dərindən bələd olub." [6,s.240]

Qara Namazov həmin kitabda şairin "Hayıf" rədifli qoşmasını və "Üstədir" divanisinin bir bəndini çap etdirmişdir.

Şair Yunus Abbasov Sara xanımla ailə həyatı qurmuş, Telman adlı oğlu olmuşdur. Telman da atasının yolunu davam etdirmiş, müxtəlif səpkili şeirlər yazmışdır. Hal-hazırda nəvə-nəticələri Göygöl rayonunda yaşayırlar.

**Aşıq Əli Şairov:** Bu sətirlərin müəllifinin "Bütöv Azərbaycan" qəzetində nəşr olunan "Aşıq Əli Şairov" adlı məqaləsindən (ixtisarla): "Şairov Əli Şamil oğlu 1913-cü ildə Göyçə mahalının Daşkənd kəndində anadan olmuşdur. O, XIX əsrin məşhur el şairi Məmmədhüseynin nəticəsidir. Aşıq Əli Şairov 1941-ci ildə İkinci dünya müharibəsinə səfərbər olunanda subay olmuşdur. Onun sonuncu məktubu 1943-cü ildə Port-Artur şəhərindən gəlmişdir.

Əli Şairov haqq vergili şair və aşıq olmuşdur. Bunu həmkəndliləri dəfələrlə söhbətlərində təsdiqləmişlər. Onun sazı və əlyazmaları son vaxtlara qədər qohumları tərəfindən saxlanıldığı söylənilsə də, hələlik bu sadalananlardan heç birini əldə edə bilməmişik. Hətta şair Məmmədhüseynin də şeirlərinin böyük bir qisminin onun əlyazmalarından əldə olunduğu söylənilir.

Aşığın həyat və yaradıcılığı haqqında xeyli araşdırma aparmışıq.

Xasay Zeynalov əlyazmasında Aşıq Əli Şairovun 14 şeirini qələmə almışdır.[14,s.104-114] Qara Namazov aşığın tərcümeyi-halını və 1 qoşmasını kitabda çap etdirmişdir.[6,s.136-137] "Durna qatarı-II" ədəbi toplusunda aşığın yaradıcılığı haqqında kiçik şərh verilməklə cəmi 5 şeiri çap olunmuşdur. [15,s.122-125]

Bu sətirlərin müəllifinin 2008-ci ildə Göyçə mahalının Daşkənd kəndinin aşıqları və şairlərinin həyat və yaradıcılıqları haqqında apardığı araşdırma və onun nəticəsi olaraq AMEA Folklor İnstitutunun Elmi şurasının qərarı ilə çap olunan kitabında Aşıq Əli Şairovun tərcümeyi-halı ilə bərabər cəmi 12 şeiri də işıq üzü görmüşdür. [8,s.60-66]

Aşıq Əli Şairovun 14 qoşması, 1 gəraylısı, 1 divanisi və 1 deyişməsi olmaqla hələlik bizə məlum olan cəmi 17 şeiri vardır." [16]

Aşığın doğum tarixini Qara Namazov 1911-ci il göstərmişdir. [6,s.136]



**Muxayıl Göyçəli.** Bu sətirlərin müəllifinin 2010-cu ildə "Elmi axtarışlar" jurnalında nəşr olunan "El şairi Muxayıl Göyçəli" məqaləsindən (ixtisarla): "Məsimov Muxayıl Budaq oğlu 1918-ci ildə doğulmuşdur. Dərzilər nəslindəndir. 1932-ci ildə Daşkənd kənd yeddiillik orta məktəbini bitirmişdir. Muxayıl ədəbiyyatı, rus dilini, cəbri özəlliklə yaxşı bilirmiş.

Böyük Vətən Müharibəsi başlayanda Muxayıl da 1941-ci ildə müharibəyə səfərbər olunmuşdur. O, 26 fevral 1942-ci ildə ağır döyüşlərin birində yaralanaraq ordudan tərxis edilmişdir. Müalicəsi doğma kənddə davam etdirilsə də, 15 dekabr 1944-cü ildə müharibədə aldığı yaralardan subay ikən əbədiyyətə qovuşmuş və Daşkənd kəndində dəfn olunmuşdur.

Muxayıl Göyçəlinin əlyazmaları və bir neçə cəbhə şəkilləri Göyçə mahalından deportasiya olunub 1988-ci ildən hal-hazıra qədər Bərdə rayonunun Yeni Daşkənd kəndində məskunlaşan qardaşı Məsimov Oruc Budaq oğlu tərəfindən qorunub saxlanılmaqdadır.

Onun 1943-cü ilə aid əlyazmasının içərisində Şair Məmmədhüseynin "Xəbər al, deyim", "Yaxşıdır" qoşmalarına, "Yatıb oyanmaz, oyanmaz" gəraylısına, İsoy Qurbanovun "Eylə", "Oldumu" və "Qaldım" rədifli qoşmalarına, Aşıq İslam Yarpızlının "Əzizim" qoşmasına da rast gəldik.

Əlyazmalardan bəlli olur ki, Muxayıl Göyçə ədəbi mühitindən, Azərbaycan klassik ədəbiyatından və şifahi xalq ədəbiyyatından lazımınca yararlanmış və şeirin müxtəlif növlərində – gəraylı, qoşma, təcnis, cığalı təcnis, divani kimi şeirlər yazıb-yaratmışdır. Yeri gəlmişkən, onu da qeyd etmək lazımdır ki, o hətta rus dilində də şeir yazmışdır.

Muxayıl həmçinin saz havalarına və saz ifaçılığına da dərindən bələd olmuşdur. Saz havalarının öyrənilməsində bibisi oğlu Aşıq İslam Yarpızlının böyük rolu olmuşdur. Cəmi 26 il ömür yaşamış Muxayıl Göyçəli el şairi kimi tanınmışdır.

Şairin yaradıcılığında qəmli şeirlər üstünlük təşkil edir. Bu da onun uzun müddət (33 ay) xəstə olması ilə əlaqədardır.

Muxayıl Göyçəlinin əlyazmalarında sadə və adi görünsə də belə, diqqətimizi çəkən bir nüansı da qeyd etməliyik. Çağdaş poeziyamızda yazılan şeirlərin sonluğunda qoyulan tarixlərə çox rast gəlinir. Bu isə son on illiklərin dəbidir, – desək yanılmarıq. Lakin 1943-cü ilə aid əlyazmada hər bir şerin sonluğunda qoyulan tarixlər şairin mütərəqqi bir şəxs olduğunu deməyə imkan verir.

Təəssüflər olsun ki, belə istedadlı el şairinin şeirləri hələ ki, tam şəkildə toplanıb çap olunmamışdır. Muxayıl Göyçəlinin şeirlərini toplayıb çap etdirməyi özümüzün mənəvi borcu hesab edirik." [17,s.11-14]

“Daşkənd aşıqları və şairləri” kitabında şairin “İndi”, “Çətindi”, “Dolanmasın”, “Məni”, “Neyləyim”, “Ayrılıqdı” rədifli qoşmalarını, “Var” rədifli bağlama-qıfılbəndini, “Yoxdu” rədifli gəraylısını, “Tərsinə gedər” rədifli cığalı təcnisini və “Əzizim” rədifli deyişməsini (Yarpızlı Aşıq İslamla) çap etdirmişdir. [8,s.79-84]

**Aşıq Süleyman.** Hüseynov Süleyman Gülalı oğlu 1919-cu ildə Böyük Qaraqoyunlu kəndində doğulmuşdur. 2 yanvar 1942-ci ildə Basarkeçər RHK-dan orduya çağırılmışdır. Süleyman Hüseynov 903-cü atıcı alayın əsgəri olmuşdur. Sonuncu məktubu 1943-cü ilin yanvar ayında 1660 saylı səhra poçtundan gəlmişdir. 1943-cü ilin mart ayında itkin düşmüşdür. [4, 58133173] İstinad etdiyimiz saytdakı digər bir sənəddə sıravi Hüseynov Süleyman Gülalı oğlunun Əzizli kəndində doğulduğu, 1942-ci ilin mart ayında itkin düşdüyü qeyd olunmuşdur. [4, 87481236] Yeri gəlmişkən, onu da qeyd edək ki, Böyük Qaraqoyunlu kəndinin adı Ermənistan SSR Ali Soveti Rəyasət Heyətinin 3 yanvar 1935-ci il tarixli fərmanı ilə dəyişdirilib Əzizli qoyulmuşdur. [11,s.148]

Yaxın qohumu Şahvələd İsmayılovun verdiyi məlumata görə, Həsənov Gülalı Hüseyn oğlunun ailəsində doğulan Aşıq Süleymanın itkin düşməsi haqqında rəsmi məlumat verilsə də, cəbhə yoldaşlarının söylədiyinə görə, sovetlər uğrunda vuruşmamaq üçün ordudan yayınmışdır. Bundan sonra Türkiyəyə, oradan isə İrana keçmiş, XX əsrin 60-cı illərinə qədər Urmiya ellərində aşıqlıq etmişdir.

Aşıq Süleyman iki çağırış SSRİ Ali Sovetinin deputatı olmuş İman Hüseynovun böyük qardaşıdır.



**Aşıq Səfiyar.** Hüseynov Səfiyar Paşa oğlu 1920-ci ildə Daşkənd kəndində doğulmuşdur. ÜİLKGİ-nin üzvü olmuşdur. 20 yanvar 1942-ci ildə Basarkeçər RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər Səfiyar Hüseynov 1943-cü ilin sentyabr ayında itkin düşmüşdür. [4, 63914855] İstinad etdiyimiz “obd-memorial.ru” saytındakı digər bir sənəddə Hüseynov Səfiyarın 1924-cü ildə doğulduğu, 1943-cü ilin martında orduya çağırıldığı, 1944-cü ilin avqust ayında Rumıniyada itkin düşdüyü göstərilir. [4, 68389259] Yenə həmin saytdakı daha bir sənəddə isə Səfiyar Hüseynovun 1920-ci ildə doğulduğu, 1944-cü ilin dekabrında orduya çağırıldığı, 1945-ci ilin yanvar ayında son məktubunun gəldiyi və 1945-ci ilin fevral ayında itkin düşdüyü göstərilir. [4, 64052409]

Daşkənd kəndində Zeynallılar nəslində doğulan Aşıq Səfiyar gənc olmasına baxmayaraq, qısa bir müddətdə nəinki Daşkənddə, eləcə də Göyçə mahalında istedadlı aşıqlardan biri kimi tanınmışdır. Aşıq Səfiyarın böyük qardaşı Ağayar (1912-1943/45) kamança və saz ifaçısı olduğundan qardaşının ustadı o özü olmuşdur. Yeri gəlmişkən, o bu sənəti əmisi oğlu,

müəllim və el şairi İsmayıl Hüseynova (1926-1995) da öyrətmişdir. [8,s.101]

Aşıq Səfiyar 1938-1941-ci illərdə Zərkəndli Aşıq İdris Məhərrəmovun rəhbərlik etdiyi Basarkeçər aşıqlar ansamblının üzvü olmuş, ifaçı aşıq olaraq bir çox el şənliklərinin, dövlət tədbirlərinin iştirakçısı olmuşdur.

Aşıq Səfiyar 1938-ci ildə İrəvanda keçirilən Aşıqlar Müsabiqəsində fəal iştirak etmiş, festivalda III yeri tutmuş, döş nişanı ilə (əvvəllər anasında olan həmin nişan hazırda qızı tərəfindən qorunub saxlanılır) təltif edilmişdir.

Aşıq Səfiyar Fərək Balış qızı (1924-2006) ilə ailə həyatı qurmuş, Məmləkət adlı qızı olmuşdur.

Apardığımız bu araşdırmanı bitmiş hesab etmək olmaz. Belə ki, müharibədə həlak olan Göyçəli aşıq və şairlərimizi tam tədqiq etmək mümkün olmadı. Haqqında məlumat əldə edə bilməsək də, adları bizə məlum olanlar var. Aşıqlardan Kazım Əhməd oğlu (İnəkdağ), Vəli Bahan oğlu (İnəkdağ) şairlərdən Əmirəhməd Məmmədov (Qızılvəng), Oruc Hacıyev (Zağalı) və başqaları haqqında gələcəkdə araşdırmalar aparmaq niyyətindəyik.

### İstifadə edilmiş ədəbiyyat:

1. **Ziyəddin Məhərrəmov.** "İrəvanda məktəbdarlıq və maarifçilik". Bakı, "Nurlan", 2010
2. **Tərlan Göyçəli**. "Göyçə aşıq məktəbi". Bakı, "Göytürk", 1998
3. **İslam Ələsgər.** "Sazlı-sözlü Göyçə". Bakı, "Azərnəşr", 1999
4. **ОБД Мемориал – https**://obd-memorial.ru/html/
5. **Ziyəddin Məhərrəmov**. "XX əsr Göyçə aşıq mühiti. 1920-1950-ci illər", Bakı, "Azərbaycan Ensiklopediyası" NPB, 1997
6. **Qara Namazov**. "Aşıqlar" I kitab, Bakı, "Səda", 2004
7. **Musa Nəbioğlu.** "Ozan-aşıq dünyası". Bakı: "Nurlan", 2010
8. **Araz Yaquboğlu.** "Daşkənd aşıqları və şairləri", Bakı, "Nurlan", 2008
9. **Aşıq Şəmşir**. "Qulağımdan getmir səsi", "Azərbaycan gəncləri" qəzeti, 16.03.1971
10. **Rübabə Şirinova.** "Zərnişanım gözlə, gözlə yolumu...", "Yada düşdü" jurnalı, № 28, İyun 2017 – http://yadadushdu.org/journal/article/369
11. **İbrahim Bayramov.** "Qərbi Azərbaycanın türk mənşəli toponimləri". Bakı: "Elm", 2002
12. Araz Yaquboğlu. "Aşıq İslam Yarpızlının həyat və yaradıcılığı haqqında". "Filologiya məsələləri" elmi toplusu, №2, 2011-ci il
13. Araz Yaquboğlu. "Aşıq İslam Yarpızlının sənət dünyası", "Ozan dünyası" jurnalı, №1(4), 2011
14. Xasay Zeynalov. "Göyçə mahalının tarixindən yarpaqlar" (əlyazma), Bakı, 2001
15. "Durna qatarı-II", (toplayıb tərtib edəni: Məhəmməd Ələkbərli). Bakı, "Nurlan", 2006
16. Araz Yaquboğlu. "Aşıq Əli Şairov", "Bütöv Azərbaycan" qəzeti, 27 iyul 2011-ci il. № 25 (113)
17. Araz Yaquboğlu. "El şairi Muxayıl Göyçəli", "Elmi axtarışlar", VI/2010, Bakı, "Nurlan", 2010

**Hafiz KƏRİMOV**
Sənətşünaslıq üzrə fəlsəfə doktoru,
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət
Universitetinin müəllimi



# BORÇALININ ƏLƏM ŞAİRİ

Qədim tarixə malik Borçalı mahalı bütün Türk dünyasında sazın-sözün beşiyi kimi tanınır. Qarapapaq türklərinin məskəni olan Borçalıda yazılı ədəbiyyatla müqayisədə şifahi yaradıcılıq ənənələri daha çox inkişaf etmişdir. Xüsusilə ozan-aşıq sənəti regionda geniş yayılmış, Azərbaycan aşıq sənətinin inkişafına böyük töhfələr verən Borçalı aşıqları öz dəsti-xətləri ilə həmişə seçilmişlər. Eyni zamanda, sözləri aşıqların dilində əzbər olan Alxas ağa Hacallı, Şair Abbasəli, Dost Pirməmməd, Şair Ağacan, Nəbi Faxralı, Novruz Təhləli və s. kimi söz ustaları, el şairləri də mühitin ədəbi-mədəni həyatında mühüm rol oynamışdır.

Borçalı mahalının XX yüzillikdə yaşayıb-yaratmış istedadlı saz-söz adamlarından biri də Yetim Mahmud olmuşdur. Yetim Mahmud 1941-ci ildə Marneuli rayonunun Sadaxlı elində dünyaya göz açıb. Hələ anadan olmamışdan əvvəl atası dünyasını dəyişdiyindən ona öz atasının adını qoymuşdular. Necə deyərlər, dünyaya bu cür talesiz gələn Yetim Mahmud demək olar ki bütün ömrü boyu da bəxtsiz, yığvalsız yaşamışdır. Həm yetimliyi ucbatından, həm də 40-cı illərin ağır, amansız şəraitindən dolayı onun uşaqlıq illəri olduqca əzab-əziyyətli keçmişdir. Ata-ana qayğısından məhrum olan balaca Mahmud düz-əməlli təhsil də görməmiş, orta məktəbin yalnız 3-cü sinfinə qədər oxuya bilmişdi. Lakin Allahın verdiyi fitri istedad sayəsində o, gənc yaşlarından şeirlər qoşmağa başlamışdır. Bu məqamda böyük şairimiz Zəlimxan Yaqubun "Yunus Əmrə dastanı" poemasından bir parça yadıma düşür:

*Əcəl aldı atasını,*
*Yer gizlədi anasını.*
*Kürək tutdu, bel götürdü,*
*Tale sökdü xanasını.*
*Qılınc ilə çaldı, çapdı,*
*Fələk qanlı iş elədi.*
*Yaman dərddi yetim qalmaq,*
*Dərd onu dərviş elədi.*

Elə bil bu sözlər həm də Yetim Mahmud üçün yazılıb. Bəli, dərd Mahmudu dərviş elədi, dərd Mahmudu şair elədi, dərd Mahmudu sözləri dillər əzbəri olan bir qələm əhli – Yetim Mahmud elədi. Fikrimizcə, o dövrdə Borçalı aşıqlığının inkişaf etmiş ənənələri də onun şairlik istedadının üzə çıxmasında az rol oynamamışdır. Belə ki, 50-ci, 60-cı illərdə Borçalı mahalında, o cümlədən

Sadaxlı çökəyində aşıq məclislərinin, dastan gecələrinin ardı-arası kəsmirdi. Dastan qəhrəmanlarının nakam məhəbbətindən kədərlənib, vüsal dəmlərindən ruhlanan, aşıqlarla şeirləşib "söz güləşdirən" gənc şairin öz ömrü-həyatı da bax beləcə dastanlaşmağa doğru gedirdi. Uşaqlıq illərində bir gün görməyən Yetim Mahmudu qabaqda fələyin daha betər "sürpriz"ləri gözləyirdi...

Talesizlikdən şairin cavanlıq çağları və ailə həyatı da bədbin notlar üzərində kökləndi. Belə ki, ilk evliliyindən heç bir övladı olmayan Yetim Mahmud, üstəlik hələ cavan yaşında iki il bir, üç il bir, on ilə qədər Gürcüstanın müxtəlif yerlərində məhbus həyatı yaşadı. İkinci evliliyindən bir oğlan övladı dünyaya gəlsə də, onun bu sevinci də gözündə qaldı. 1972-ci ildə onu Arxangelsk vilayətinə göndərib uzun müddətə həbs etdilər (əhəmiyyətsiz olduğuna görə həbs olunma səbəbini qeyd etməyi lazım bilmirik). Cavan yaşında həyatı zülmətə çevrilən və yetimliyin nə olduğunu yaxşı bilən bir adam kimi, indi öz körpəsinin də yetim qalması Yetim Mahmudu yandırıb-yaxırdı:

*İlahi heç kəsi dərdə salmasın,*
*Heç kəsin balası yetim qalmasın.*
*Sinələr dağlayan bir iş olmasın,*
*Yüz də döy başına, olandan sonra.*

1987-ci ildə həbs müddəti qurtarıb evə qayıdanda 9 aylıq ikən qoyub getdiyi körpəsi Muzayət, indi 15 yaşında cavan oğlan idi. Həbsxana dövrü Yetim Mahmud yaradıcılığının böyük bir hissəsini təşkil edir. On beş ildə Yetim Mahmud, necə deyərlər, qəm kotanını qoşub, dərd əkdi, yazdı, özü də göynəyə-göynəyə, həm də göynədə-göynədə yazdı, nisgil dolu yazdı, həsrət qarışıq yazdı, şeirlərinin mayası qəm oldu, ələm oldu, sitəm oldu...

Yetim Mahmudun iki şeirlər kitabı işıq üzü görmüşdür. "İnsan harayı" adlı birinci kitabı 1996-cı ildə, "Dağlar düşüb yadıma" adlı ikinci kitabı isə 2002-ci ildə çap olunub. Yetim Mahmud gəraylı, qoşma, qoşayarpaq-qoşma, təcnis, cığalı təcnis, dodaqdəyməz cığalı təcnis, divani, müxəmməs kimi aşıq şeir şəkillərində qələmini sınamış, bir-birindən gözəl, dəyərli və təsirli poetik örnəklər yaratmışdır. Janrından asılı olmayaraq şeirlərinin əksəriyyətində vətən həsrəti, el-oba sevgisi, qürbət yanğısı dilə gətirilir:

*Qohumdan, qardaşdan yad olan canım,*
*Qorxuram kimsəsiz öləm bu yerdə.*
*Yüküm qəm yüküdür, köçür karvanım,*
*Alan yox, yükümü böləm bu yerdə.*

Şairin yaradıcılığının böyük bir qismi də fəlsəfi-didaktik mövzudadır. Hər cür çətinliklərlə üzləşən Yetim Mahmudun həyatda ən böyük müəllimi elə özünün başına gələn "həyat dərsləri" olmuşdur. Həyat onu sıxa-sıxa, əzə-əzə, qaynada-qaynada bişirmişdi, olğunlaşdırmışdı. Ona görə də, insan və dünya münasibətləri, olum və ölüm fəlsəfəsi Yetim Mahmudun yaradıcılığında özünəməxsus orijinallıqla təzahür edir. Onun şeirlərində dünyaya öz baxış bucağından baxan, ağdan qaranı, yaxşıdan yamanı seçə bilən kamil bir insan modeli görünür:

*Qızıldan qiymətli ay yazıq insan,*
*Öləndə qəpiyə alan da yoxdur.*

*Pulsuz müştəridir qoca qəbristan,*
*Qoyub qayıdırlar, qalan da yoxdur*

– deyən şairin kamillik mərhələsində necə də ali bir məqama çatdığını, hansı fəlsəfi-ürfani düşüncənin yiyəsi olduğunu təsəvvür etmək elə də çətin deyil. Haqqında danışdığımız mövzuda diqqətimizi çəkən çoxsaylı örnəklərdən biri də "Yüküm" rədifli divanisidir:

*Yetim Mahmud gecə-gündüz*
*Sidqin bağlar xudaya,*
*Oxuduqca əhsən deyər*
*Ustad yazan haqq-saya.*
*Yüz yaşasam, min yaşasam –*
*Getməliyəm üqbaya,*
*Qismət olsa, ölən vaxtı*
*Beş arşın bezdi yüküm.*

Məlum olduğu kimi, insan oğlunun kəfəndən başqa dünyadan heç bir şey apara bilməyəcəyi bir çox söz-fikir adamlarının əsərlərində vurğulanmışdır. O cümlədən ustad Aşıq Ələsgər yazırdı ki, "Çox qazansan, az qazansan, beş arşın ağdı xələt, Mal-dövlətə baş endirən əfsana baş endirir". Lakin Yetim Mahmud öz orijinal yanaşması ilə daha dərinə gedərək "Qismət olsa ölən vaxtı, Beş arşın bezdi yüküm" deyir və o beş arşın kəfənə də şübhə ilə, arzu ilə yanaşır. Çünki doğurdan da həqiqət belədir ki, bu ölüm-itim dünyasında it-bata düşüb, qurda-quşa yem olan, o biri dünyaya kəfənsiz gedən insanlar da az olmamışdır. Deməli beş arşın kəfənin də qismət olub-olmayacağı bəlli deyildir. Bu mənada Yetim Mahmudun poetik yaradıcılığı ibrətamiz məqamlarla zəngin olub, dərin məna-məzmun kəsb edir.

Şairin sevgi-məhəbbət mövzusunda yazdığı şeirlər olduqca azdır. Çox güman ki, bu da onun keşməkeşli ömür yolu ilə əlaqədardır. Sevgi dolu bir cavanlıq görüb eşq macəraları yaşamadığından, bu mövzuda olan şeirlərinin bir neçəsinin də orta və ahıl yaşlarda yazıldığı məlum olur. Məsələn "Gözəllər" rədifli şeirində belə bir beyt var:

*Doğma balam kimi sevirəm qızım,*
*Düz anlayın mən qocanı gözəllər.*

Yaxud "Amandır" rədifli sevgi şeirində oxuyuruq:

*Dillərdə dastanam, adı bəlliyəm,*
*Yerim Sadaxlıdır, ağır elliyəm.*
*Qoca deyil, san-hesabda əlliyəm,*
*Onun da otuznu sayma, amandı.*

Burada əlli yaşdan otuzunu ona görə sayma deyir ki, ayrı-ayrı vaxtlarda on ilə qədər Gürcüstanda, on beş il isə Arxangelskdə həbsdə olduğundan ömrünün iyirmi beş ilini bada vermişdi.

Qeyd edək ki, Yetim Mahmudun təbiət və sırf dini mövzuda yazdığı şeirləri də barmaqla sayılacaq qədər azdır.

1987-ci ildə həbsxanadan azad olan Yetim Mahmud elinə-obasına döndü və ömrünün axırına qədər Sadaxlıda yaşadı. 80-ci illərin sonu, 90-cı illərin əvvəlində Azərbaycan xalqına qarşı törədilən vəhşiliklər, qanlı-qadalı hadisələr, torpaqların itirilməsi hər bir Borçalı türkü kimi Yetim Mahmudu da dərindən sarsıtdı:

*Neynəyim əlimdə yoxdur fərmanım,*
*Ürək döyünsə də xəstədir canım,*
*Alovdan don geyib Azərbaycanım,*
*Bağla gözlərimi, bağla, ay arvad*

Yaxud:

*Mahmudam, qış keçir, yazım,*
*Cəngi çalır telli sazım.*
*Millətinə kömək lazım,*
*Qalx ayağa Azərbaycan!*

1988-ci ilin sonlarında Şamlıq qəsəbəsindən əvvəlcə Sadaxlıya, oradan isə Azərbaycana pənah gətirən 5 nəfərdən ibarət ailənin köçməsində Yetim Mahmud şəxsən iştirak etmişdi. Həmin şahidi olduğu real hadisələr əsasında düzüb-qoşduğu kiçik həcmli "Əhmədxan və Anahid dastanı" bu gün tarixi əhəmiyyət daşımaqla bərabər, Yetim Mahmudun şeir çələngində fərqli bir ətrə malik çiçək kimi boy verir.

El-oba, yurd-yuva qədri bilən, vətənə, millətə ürəkdən bağlı olan Yetim Mahmud itirilən hər qarış torpaq üçün sözün əsl mənasında sızıldayırdı. Çünki o, Azərbaycan mövzusuna bütöv və böyük Azərbaycan kontekstindən yanaşırdı:

*Borçalı tək bir yanın var,*
*Təbrizin var, Şirvanın var.*
*Bir ürəkdə min canın var,*
*Azərbaycan, Azərbaycan!*

Eləcə də, Borçalı və Sadaxlı mövzusu Yetim Mahmudun qələmi üçün olduqca doğma, olduqca əziz və müqəddəs idi. O, yurdunun gözəlliklərindən ilham alır, igidləri ilə öyünür, Borçalı mahalı ilə fəxr edirdi:

*İgidlər yurdudur, şair ocağı,*
*Borçalı tək bir diyarım var mənim.*
*Cənnət guşəsidir hər bir bucağı,*
*Fəxr etməyə ixtiyarım var mənim.*

Yetim Mahmudun sənətdə xoşbəxtliyi onun bir saz şairi olmasında idi. Qələmindən çıxan hər bir şeir sazın bağrına yatdı, boyuna biçildi. Çünki o, sazı yaxşı bilirdi və duyurdu. Təsadüfi deyil ki, bütün yaradıcılığı aşıq şeir şəkilləri üzərində qurulmuşdur. Buna görə də bu şeirlər aşıqların sinəsində el-el, oba-oba gəzdi və dillər əzbərinə çevrildi. Borçalının əksər ustad sənətkarları Yetim Mahmuddan sözlər oxumuşdur və bundan sonra da şübhəsiz ki, oxuyacaqlar. Bu

məsələdə Aşıq Mehman Məhəmmədoğlunun adını xüsusilə vurğulamaq lazım gəlir. Demək olar ki, şairin bütün yaradıcılığını sinədəftər edən Aşıq Mehman sözügedən poetik örnəklərin geniş yayılmasında əvəzsiz xidmətlər göstərmişdir.

Yetim Mahmud Arxangelsk vilayətinə göndərildikdən sonra, yeganə övladlarını böyük çətinliklə, əzab əziyyətlə böyüdən həyat yoldaşı Güllü (Güllünaz) xanım düz 15 il onun yolunu gözləmişdi. Şair elinə-obasına, evinə-eşiyinə döndükdən sonra yazırdı:

*Dilimin əzbəri Sadaxlı eli,*
*Vətənsiz insanın bükülər beli.*
*Yetim Mahmud olmaz Haqqa gileyli,*
*Ağlar qalan Güllünaza yetişdim.*

Onlar 2003-cü ilə qədər bərabər ömür-gün yaşadılar. 2003-cü ildə isə Yetim Mahmud uzun sürən xəstəlikdən sonra dünyasını dəyişdi, əbədiyyətə qovuşdu. Beləliklə, 15 ilin həsrətindən sonra 16 illik evlilik dönəminin ardından bu günə kimi yenə də 15 ildir ki, Güllü xanım öz həyat yoluna şairsiz davam edir. Allah Güllü xanıma ömür versin.

Sonda Yetim Mahmudla bağlı bir vacib məsələni də qeyd etmək istərdim. Elimizin gənc və istedadlı müğənnisi Elməddin Cəfərov bu yaxınlarda mənə maraqlı bir hadisə danışdı. Təxminən 2006-cı ildə Elməddin öz dəstəsi ilə Gürcüstanın Kareli kəndinə toya gedibmiş. Orada bir gecə toy sahibinin qonşuluğunda qalmalı olublar. Gürcü soyadı daşıyan Hüseyn adlı ev yiyəsi bunların Sadaxlı elindən olduğunu bilib soruşur ki, Yetim Mahmudu tanıyırsınızmı? Bu zaman Elməddingil Yetim Mahmudun eldə-obada dəyərli bir şair kimi sevildiyini və onun 2003-cü ildə rəhmətə getdiyini deyirlər. Bu cavabı eşidən Hüseynin gözləri yaşarır, Yetim Mahmudla həbsxanada uzun müddət bərabər qaldıqlarını bildirir və gedib o biri otaqdan içində gürcü əlifbası ilə yazılmış şeirlər olan qalın bir dəftər gətirir. Hüseyn bunların hamısının Yetim Mahmudun öz dilindən yazdığını söyləyir və bir neçəsini də oxuyur. Sonra Yetim Mahmudun ellisi olduqları üçün Elməddingili Hüseyn kişi çox böyük hörmət-izzət ilə evində qonaq edir... Elməddin Cəfərov deyir ki, onun oxuduğu şeirlərin heç biri bizə tanış gəlmədi. Çox güman ki, həmin dəftərdə olan şeirlərin bir çoxu əlimizdə olan kitablarda yoxdur. Yetim Mahmudun oğlu Muzayət müəllim də bildirdi ki, evdə olan bəzi əlyazmalar kitaba düşməyib. Yeri gəlmişkən onu da qeyd etmək istəyirəm ki, şairin indiyədək işıq üzü görmüş iki kitabı metodologiya baxımdan bir qədər qeyri-peşəkar səviyyədə çap olunmuşdur. Əlbəttə, Yetim Mahmudun yaradıcılığının qorunub bu günə gəlməsində həmin nəşrlərin dəyəri əvəzsizdir. Lakin çap olunan şeirlər üzərində nə janr, nə də mövzu nöqteyi-nəzərindən təsnifat işi aparılmamışdır. Təcnislər qoşmalara, qoşmalar gəraylılara, divanilər müxəmməslərə qarışmışdır. Fikrimizcə, yuxarıda qeyd etdiyimiz gürcü əlifbası ilə olan şeirlərin tapılıb saf-çürük edilməsinə, bununla bərabər, kiril və latın qrafikası ilə çap olunmuş kitabların birləşdirilərək sistemli şəkildə yenidən işıq üzü görməsinə böyük ehtiyac duyulmaqdadır. Şairin üçüncü və mükəmməl bir şeirlər kitabını görmək arzusu ilə hələlik bu qədər...

Ruhun şad olsun Yetim Mahmud!!!

Yetim MAHMUD

## YOXDUR

Qızıldan qiymətli ay yazıq insan,
Öləndə qəpiyə alan da yoxdur.
Pulsuz müştəridir qoca qəbristan,
Qoyub qayıdırlar, qalan da yoxdur.

Qucur bədənləri o qara torpaq,
Gözdən uzaq düşür, könüldən iraq.
Qaranlıq məzarda yanmayır çıraq,
Beş dəyqə mehmanın olan da yoxdur.

Həqiqi dünyanı gəzdi xəyalım,
Ölüm yada düşdü pozuldu halım.
Adım Yetim Mahmud, Sadaxlı elim,
Ağlaram, göz yaşım silən də yoxdur.

## ÜSTÜNDƏ

İlahi bir kəsə versə qisməti,
Göyərər zəmisi daşın üstündə.
Aldatmaz dünyanın şanı-şöhrəti,
Bir ağıl cəm olsa başın üstündə.

Müxənnət zamanın kor olsun gözü,
Tutulmur yoxsulun həqiqət sözü.
Adam var, bir qanmaz ulaqdır özü,
Sərkərdə seçiblər qoşun üstündə.

Mən necə qandırım axmağa, səyə
Söz tapmıram yaraşdırıb deməyə.
Dönüb tamahkarlar quduz köpəyə,
Boğur bir-birini leşin üstündə.

Ana bədənindən gəlməmiş hələ,
Adını mələklər yazdı cədvələ.
Karvanın çatacaq nə vaxt mənzilə,
Möhr oldu alnına qaşın üstündə.

Mən Yetim Mahmudam dillərdə dastan,
Fələk bir bağbandır, insanlar bostan.
Evim qəbir olar, elim qəbristan,
Oxunar ünvanım daşın üstündə.

## OLMA

Qoy el tərifləsin ay oğlum səni,
Heç zaman özünü öyəndən olma.
Vaxtında seçiynən dostu, düşməni,
Sonradan başına döyəndən olma.

Yaxşı eşit haqq söyləyən dərvişi,
Olsa da əlində hökmün gərdişi.
Bacar, düzəldəsən bir müşkül işi,
Düzəldə bilməsən əyəndən olma.

Zərin şeş gətirər versə yığvalın,
Ötkün sözün olar, kəskin kamalın,
Göstər məzarını o Rüstəm-Zalın,
Dünyada bir mənəm deyəndən olma.

Kişinin mayası halaldan gərək,
Öz bağını özün becər, özün ək.
İlan sümüyüdür zəhmətsiz çörək,
Zəhmətsiz çörəyi yeyəndən olma.

Mən Yetim Mahmudam, soruşsan məni,
Cəhd eylə incitmə heç bir kimsəni.
El-oba ucaldar göylərə səni,
Fağırın qəlbinə dəyəndən olma.

## SÖYLƏRƏM

Yatmaqla arzuya çatan görmədim,
Ay oğul, zəhmətə alış, söylərəm.
Yaxşıdan dərs öyrən, yamandan gen gəz,
Kişi cərgəsinə qarış söylərəm.

Pis işdən əl götür, uyma şeytana,
Ata nəsihəti sərvətdir sana.
Həyatın, varlığın anadır, ana,
Səcdə et, boynuna sarış söylərəm.

Gər istəsən xoşbəxt görmək özünü,
Eşit həqiqəti, danış düzünü.
Heç zaman harama dikmə gözünü,
Halal qazanmağa çalış söylərəm.

Zəhmətlə zirvəyə ucalır insan,
Daim cavan qalmır, qocalır insan,
Hər yerdə birlikdən güc alır insan,
Çox olsa yaxşıdır tanış, söylərəm.

Fərsizə var olmaz ata varından,
Hər ağac bəllidir bəhrə-barından,
Bu yolu-ərkandan, haqq bazarından,
Sən Yetim Mahmuddan soruş, söylərəm.

**HAYIF**

Bir başda ki ağıl-kamal olmaya,
Havayı yük olar ayağa, hayıf.
Adam var, məzarı qızıldan gərək,
Adam var, beş arşın ay ağa, hayıf.

Çarxı-fələk hərdən baxır qıyğacı,
Mərdin süfrəsini eyləyir acı.
Tülküyə bağışlar o şahlıq tacı,
Aslanı endirər ayağa, hayıf.

Mən Yetim Mahmudam, qəm çalır sazım,
Yazıldı tərsinə taleyim, yazım.
Varmadı mənzilə mətləb, murazım,
Yıxıldım, durmadım ayağa, hayıf.

**Rübabə ŞİRİNOVA**
**AMEA Əlyazmalar İnstitutu,**
**fəlsəfə üzrə fəlsəfə doktoru, dosent**

# ƏRTOĞRUL CAVİD AŞIQ ŞİRİN YARADICILIĞI HAQQINDA

Azərbaycan aşıq sənətinin yüksək zirvəyə çatmasında Göyçə aşıq məktəbinin əvəzsiz rolu var. Bu məktəbin yetirmələrindən biri də el sənətkarı Aşıq Şirin olmuşdur. Aşıq Şirinin söylədiyi şeirlər, nağıllar, dastanlar sağlığında dilindən qələmə alınsa da, təəssüf ki, illərlə dövlət arxivlərində tədqiqatçıların diqqətindən kənarda qalaraq çap olunmamışdır. Aşıq Şirin haqqında ilk məlumatı Dədə Şəmşirin "Azərbaycan gəncləri" qəzetinin 1972-ci il 16 mart tarixli sayında çap olunan "Qulağımdan getmir səsi" adlı məqaləsindən almışıq.

Dədə Şəmşir yuxarıda qeyd etdiyimiz "Qulağımdan getmir səsi" adlı məqaləsində (1.1,250;3.5) Şirinin oğlu Aşıq İdris haqqında yazır ki: "Aşıq İdris aşıqlıq sənətinə erkən maraq göstərmiş, 12 yaşında ikən atası Aşıq Şirindən ilk ustad dərsi almışdır".

Aşıq Şirin haqqında ikinci bir məlumatı isə folklorşünas alimimiz Rüstəm Rüstəmzadənin "Gənclik" nəşriyyatı tərəfindən 1984-cü ildə çap olunan "El qəhrəmanları xalq ədəbiyytında" kitabından əldə etmişik (4.67). Müəllif xalq qəhrəmanı "Qaçaq Kərəm" haqqında tədqiqat apararkən AMEA Memarlıq və İncəsənət İnstitutunun arxivində rast gəldiyi "Kərəm xan Sərtib" dastanından söhbət açaraq yazır: "Dastanın başqa bir variantı Bülbülün rəhbərliyi ilə 1937-ci ildə Memarlıq və İncəsənət İnstitutunun əməkdaşlarının Şəki ekspedisiyası zamanı Aşıq Şirin Məhərrəm oğlu İsmayılovdan toplanmışdır". Orada verilmiş qeyddən göründüyü kimi, o vaxt Aşıq Şirinin 90 yaşı olmuşdur. "Kərəm xan Sərtib" dastanını isə yeznəsi Aşıq Məhərrəmdən öyrənmişdir. Memarlıq və İncəsənət İnstitutunun arxivinə müraciət etdik. Arxivdən həmin dastanı, aşığın həyat və yaradıcılığı haqqında olan qısa materialları aşkar etdik. 61№-li qovluqda olan həmin materiallar iki şagird dəftərinə yazılmışdır. Dəftərin birinci səhifəsi belə başlayır: "Şirin Məhərrəm oğlu İsmayılovun 90 yaşı vardır. 30 il aşıqlıqla məşğul olmuşdur. İndi qocaldı-ğından oğlu Aşıq İdrisin himayəsində olur". "Kərəm", "Dilqəm" nağıllarını yeznəsi Aşıq Məhəmməddən öyrənmişdir. Aşıq Məhəmməd Zərzəbilli olub, hal-hazırda sağ deyil. Şirin kişi sovet tematikası ilə də yeni sözlər yazır, çünki özü yaradıcıdır. Bildiyi nağıllar bunlardan ibarətdir: "Tahar", "İbrahim", "Abdullah", "Alı xan", "Nəcəf", "Hüseyn", "Novruz", "Muqim şah", "Xəstə Qasım", "Valeh", "Bəy Çoban", "Dilqəm", "Kərəm", "Koroğludan iki nağıl" (2.143; 12.4).

Aşıq Şirinin yaradıcılıq nümunələri poetik baxımdan mükəmməlliyi, dil-üslub xüsusiyəti baxımından orijinallığı ilə diqqəti cəlb edir. Məlum olduğu kimi, aşıq poeziyası mövzu baxımından bir neçə semantik mərkəzdən ibarətdir. Bunların içərisində dini-ürfani kontekstlə dünyəvi-estetik konteksti özündə birləşdirən məhəbbət mövzusu-gözəlləmələr əsas semantik mərkəzlərdəndir. Bu

baxımdan, Aşıq Şirinin "Gözəlləmə"si poetik baxımdan təkrarsızlığı, ritmik oynaqlığı ilə diqqəti cəlb edir:

*Mən ki sənin özündən,*
*Olmuşam divanə, gözəl.*
*Zülfünə şanə çəkib,*
*Tökürsən hər yanə, gözəl.*

*Həmişə yaz olanda*
*Çıxırsan seyranə, gözəl.*
*Dərdindən oldum xəstə,*
*Həkimin-loğmanə, gözəl...*

Bu gözəlləmədə sənətkarın qüdrəti dil-üslub, poetika özəllikləri, təşbeh-metafora mükəmməlliyindən başqa, həm də özünü onda göstərir ki, mətndə gözəlin tərənnümü ilə aşiqin (aşığın) əhvalı arasındakı tərs mütənasiblik, estetik əks praporsiya gözlənilmişdir. Gözəlliyin artan xətlə təsviri ilə paralel olaraq aşiqin xətlə aşağı düşən əhvalı (dərdindən oldum xəstə!) birinci semantik təmayülü ikinci semantik təmayülün nəticəsi olaraq bədii baxımdan fakktlaşdırır. Beləliklə, mətndə semantik praporsiya ilə yanaşı, semantik səbəb-nəticə əlaqəsi də əksini tapır. Bütün bu xüsusiyyətlər Aşıq Şirinin üstündə dayandığı aşıq sənətinin poetik ənənələrinə sadiqliyinin, bu ənənələri öz istedadının qüdrətilə yenidən ehtiva etməsinin nəticəsidir. Aşığın "Şirindi" rədifli qoşması isə onun istedadının tamamilə başqa bir istiqamətini üzə çıxarır. Bu şeirdə aşığın ustadlığı, aşiqliyin etik-estetik prinsiplərini təqdim etməsindən bəlli olur. Mətnin poetik intonasiyasındakı hökm, hərbə-zorba motivləri şeirin sənət meydanı kontekstini üzə çıxarır (9.3;13.5-6).

Dastan folklor informasiyasının ən iri struktur vahidi kimi özündə, bir tərəfdən etnik-bədii özünüifadəni əks etdirirsə, digər tərəfdən mətn subyektinin – müəllifin fərdi yaradıcılıq xüsusiyyətlərini şifrələyir. Bu baxımdan Aşıq Şirinin "Qafar və Teymur", "Maral", "Nadir şah", "Kərəm xan Sərtib" dastanları sözügedən istiqamətləri özündə sintetik olaraq birləşdirir.

Bu məlumatdan sonra "Kərəm xan Sərtib" dastanı aşığın dilindən iki şagird dəftərinə tam şəkildə yazılmışdır. Dəftərin sonunda olan "Aşıq Şirin Məhərrəm oğlu İsmayılovun söylədiyi "Kərəm" haqqında – Ərtoğrul Cavid" adlı yazı diqqətimi cəlb etdi. Yazıdan məlum olur ki, Ərtoğrul Cavid bu dastana rəyi 19/11.39-cu ildə yazmışdır (11.5; 12.6).

50a №-li qovluqda isə Aşıq Şirinin iki şerini: "Şuraya", "Gözəlləmə"; "Gürcü qızı", "Maral" nağıllarını və "Nadir şah" dastanını üzə çıxarmışıq. Bu materiallar isə üç şagird dəftərinə yazılmışdır və həmin dəftərin sonunda Ərtoğrul Cavidin yazdığı rəy verilmişdir: "Aşıq Şirin Zər-zəbillinin şeirləri və söylədiyi əsərlər haqqında – Ərtoğrul Cavid".

69a №-li qovluqda isə Aşıq Şirinin söylədiyi "Qafar və Teymur" nağılı üç şagird dəftərinə yazılmışdır. Həmçinin bu nağıla da Ərtoğrul Cavid rəy

yazmışdır. "Aşıq Şirinin söylədiyi "Qafar və Teymur" nağılı haqqında Ərtoğrul Cavid" (14.v.87).

Bu rəyləri oxuduqca millət vəkili, filologiya elmləri doktoru Rafael Hüseynovun "Vaxtdan uca" kitabında "Cavidlər" sənədli romanında Ərtoğrul Cavid haqqındakı yazıları yadıma düşür. Orada yazılır ki, 1939-cu il iyunun 22-də konservatoriyanın nəzdindəki xalq musiqisini tədqiq edən kabinənin rəhbəri Ərtoğrul ilə müqavilə bağlayır. Ərtoğrul Cavid Bülbülün başçılıq etdiyi bu kabinetdə müxtəlif istiqamətdə işləyirdi. Qocaman sənətkarları, tanınmış xanəndələri dəvət edib onların ifasında nadir, unudulan el havalarını, nəğmələri, çalğıları fonovalisə yazırdı. Xalq içindəki söz bilicilərinin, aşıqların, dastançıların dilindən nağıllarımız, söyləmələrimiz, söz sərvətlərimizin müxtəlif örnəkləri yazıya köçürülürdü. Həmin əlyazmaları səriştə ilə təhlil etmək, lazım gələrsə, əl gəzdirmək, yaxşısını pisindən ayırmaq lazım idi. Ərtoğrul Cavid bu materialları oxuyur, rəy verirdi…

"Bülbül dayı, hər halda darıxmağa macal olmayıb. Bu ay 640 səhifəlik materialı oxumuşam, rəy vermişəm. Bir neçə yazı vardı ki, xüsusən xoşuma gəldi. Nə qədər bilmədiyimi öyrəndim. Şəkidə, Xızıda, Basarkeçərdə, bir də tatlardakı toy adətləri haqda yazırlar çox maraqlıdır. Həm musiqi, həm də etnoqrafiya baxımından. Bunların hamısından istifadə edib elə kitab yazmaq olar ki!

"Qul Yusif və Məhəmməd", "Nəfs və mərifət", "Müqüm xan", "Dədə Qasım", "Maral xanım", "Cəmşid və Teymur" dastanlarını oxuyub rəy hazırlamışam".

R.Hüseynov əlavə edir ki, Bülbül Ərtoğrulun işlərinə sevinirdi. Ən əvvəl ona sevinirdi ki, başçılıq etdiyi kabinetin fəaliyyətində Ərtoğrulun varlığı ilə xüsusi bir canlanma əmələ gəlib, işlər sürətlə, sahmanla, ağılla icra olunur. Və bir də açıqca deməsə də, ürəyində ona sevinirdi ki, Ərtoğrul əsl Cavidə layiq oğuldur (6.104).

Mənə elə gəlir ki, babam Aşıq Şirinin yuxarıda adları çəkilən şeir, nağıl və dastanlarının çap olunmamasının səbəblərindən biri də repressiya qurbanlarından olan Azərbaycan xalqının böyük mütəfəkkiri, filosofu Hüseyn Cavidin oğlu Ərtoğrul Cavidin bu əsərlərə yazdığı rəylər olmuşdur. 1939-1940-cı illərdə latın əlifbası ilə yazılan və illərlə dövlət arxivlərində qalan həmin əsərlər üstündən 74 il keçməsinə baxmayaraq yenidən işıq üzü görüb, latın əlifbası ilə nəşr olunur.

Adlarını sadaladığım həmin dəftərlərdə Ərtoğrulun başqa aşıqların şeirlərinə, nağıllarına və dastanlarına yazdığı rəylər də var. Bu materiallar 2011-ci ildə Cülbəniz Babaxanlının rəhbərliyi altında 12 cilddə "Azərbaycanın qeyri-maddi mədəniyyət abidələri və Ərtoğrul Cavid" adı altında kitab şəklində nəşr olunmuşdur (son iki cild sonralar nəşr olunmuşdur). Redaksiya heyəti: Mahmud Kərimov, Cülbəniz Babaxanlı, Aybəniz Əliyeva, Teymur Kərimli, Məhərrəm Qasımlı, Fəridə Quliyevadır.

Babam Aşıq Şirinin söylədiyi şeirlər, nağıllar və dastanlar bu oncildliyin dördüncü (s. 244-279; 61a qovluğunda) və beşinci (s. 53-73; 50a qovluğunda olan materiallar bu cilddə öz əksini tapmışdır) cildlərində nəşr olunmuşdur (5.5, 53-73).

Oncildliyin III-VIII cildləri "Azərbaycan dastanları və Ərtoğrul Cavid" adlanır. G.Babaxanlı bu cildlərin hər birinə ön söz yazmış və burada hər cilddəki

materialın ruhundan çıxış edərək Ərtoğrul Cavid fenomeninin çoxcəhətli xüsusiyyətlərini aşkarlamağa çalışmışdır. Bu kitabın son iki cildi “Azərbaycan aşıq yaradıcılığı və Ərtoğrul Cavid” adlanır. G.Babaxanlı bu cildlərə uyğun olaraq “Dahi şairin şeirşünas oğlu” və “Aşıq Ələsgər və poetik çevrəsi haqda qiymətli araşdırma” adları altında ön söz yazmışdır. Müəllif belə hesab edir ki, anlamaq, dəyərləndirmək, həqiqi söz incisini saxtasından ayırmaq üçün araşdırıcı və tənqidçi özü şeir yazmasa belə, ruhunun dərinliklərində şair olmalıdır. Onun ruhunun dərinliklərindəki bu şairlik, bu yaradıcılıq istedadı Azərbaycanın dahi mütəfəkkiri atası Hüseyn Cavidin qanından, ruhundan gəlmişdi (10.9).

Respublikanın birinci vitse prezidenti, Heydər Əliyev Fondunun prezidenti, YUNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri, Azərbaycanın birinci xanımı Mehriban xanım Əliyevanın qayğısı nəticəsində Azərbaycan muğamı və Azərbaycan aşıq yaradıcılığı YUNESKO tərəfindən bəşəriyyətin qeyri-maddi mənəvi sərvətləri siyahısına daxil edilmişdir. 10 cildliyə daxil olan materialların əksəriyyəti məhz mədəni irsimizin bu iki qoluna aiddir və onların nəşri bu baxımdan təkcə ölkəmiz üçün deyil, bütün mütərəqqi bəşəriyyət üçün, başqalarının mədəniyyətinə hörməti öz mədəniyyətinə hörmətin təsdiqi kimi qəbul edən xalqlar və insanlar üçün əhəmiyyətlidir.

## MƏNBƏLƏR VƏ ƏDƏBİYYAT:

1. Azərbaycan ədəbiyyatı tarixi, Ic., Bakı, “Elm” nəşriyyatı, 1960.
2. Azərbaycan SSR Elmlər Akademiyası Nizami adına Xalqlar Dostluğu Ordenli Ədəbiyyat İnstitutu. Azərbaycan Sovet ədəbiyyatşünaslığı 1920-1975. Biblioqrafiya, “Elm” nəşriyyatı, Bakı -1983
3. Aşıq Şəmşir. Qulağımdan getmir səsi. Azərbaycan gəncləri qəzeti. 16 mart, 1971.
4. Dədə Şəmşir yaddaşlarda. Toplayıb tərtib edəni Qənbər Şəmşir oğlu,. Gənclik nəşriyyatı. Bakı, 2000
5. Azərbaycanın qeyri-maddi mədəniyyət abidələri və Ərtoğrul Cavid. AMEA Hüseyn Cavidin ev-muzeyi. I-XII. Bakı Çaşıoğlu, 2011. Redaksiya heyəti: Mahmud Kərimov, Cülbəniz Babaxanlı, Aybəniz Əliyeva, Teymur Kərimli, Məhərrəm Qasımlı, Fəridə Quliyeva.
6. Hüseynov R. Vaxtdan uca. Bakı, 1987
7. Məhərrəmov Z. XX əsr Göyçə Aşıq mühiti (1920-1950-ci illər). Avtoreferat.
8. Rüstəmzadə R. El qəhrəmanları xalq ədəbiyyatında, Gənclik. Bakı, 1984
9. Sazlı-sözlü Göyçə. Toplayıb tərtib edən və ön sözün müəllifi İslam Ələsgərli. Azərbaycan Dövlət nəşriyyatı. Bakı. 1999
10.Sərxan Xavəri, Seyfəddin Rzasoy. “Azərbaycan qeyri-maddi mədəniyyət abidələri və Ərtoğrul Cavid 10 cildliyi haqqında”, “Xalq qəzeti” 8 may 2012-ci il s. 9
11. Şirinova R. Aşıq Şirinin söylədiyi “Kərəm” dastanı və Ərtoğrul Cavidin naməlum əlyazması. Xalq qəzeti, 1 iyun 1999
12. Şirinova R. Ərtoğrul Cavid və folklorumuz. “Elm” qəzeti, 4 may 2000
13.Şirinova R. Göyçə aşıqları. Aşıq Şirin, Aşıq İdris. Bakı, Nurlan 2003
14.Şirinova R. Aşıq Şirinin söylədiyi “Kərəmxan Sərtib” dastanı. Filologiya məsələləri, V c., Bakı.2000
15.Vəzirov N.B. Qaçaqlar. AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu. Fond 4s.v. 3; s.v. 4; s.v



**Əlixan YƏHYAOĞLU**

# UNUDULMAZ SƏNƏTKAR

Aşıq Əmir – Əmir Muxtar oğlu Həsənov 1923-cü ildə Gürcüstanın Bolnisi rayonunun Sarallar kəndində dünyaya göz açıb. Muxtar kişi gözünün ilki olan oğlu Əmiri həmişə yanında gəzdirər, el şənliklərinə, toy məclislərinə aparardı. O da, maraqla çalıb-oxuyan aşıqları həvəslə dinləyərdi.

**HAŞİYƏ:** Bir dəfə anası Qızyetərlə bazara gedən balaca Əmir mağazada oyuncaq çalğı alətini görüb onu alması üçün ağlayır. Anası satdığı malların pulu ilə oğlunun istəyini yerinə yetirir. O gündən balaca Əmir öz havasını çalmağa başlayır.

Muxtar kişi oğlunu vaxtilə Ağbabadan gəlib Sarallarda yaşayan ustad Aşıq Məhəmmədin yanına aparıb: "Aşıx Məhəmməd, başına dönüm, bu uşağı yoxla, xoşuna gəlsə, qoy yan-yörəndə hərrənsin, əl buyruqçun olsun", – deyir. Dünyagörmüş Aşıq Məhəmməd ustad gözü ilə Əmiri başdan-ayağa süzür, səsini, şeir deməsini yoxlayır və "A Muxtar kişi, uşax səmitdi, fərəsətdi uşağa oxşuyur. Qoy qalsın. Bizim Mehralıynan bir yerdə oynuyar", – deyir. Gənc və istedadlı Əmir Aşıq Məhəmmədə şəyirdlik etdiyi müddətdə ondan çox şeylər öyrənir. Təəssüf ki, ustad-şəyird münasibəti uzun sürmür. İkinci dünya müharibəsi (1941-1945) illərində Aşıq Məhəmməd ailə vəziyyəti ilə əlaqədar Sarallardan köçür.

**SÖZARASI:** Əmir sazla davranmağı öyrənəndən sonra, Qurvanalı Yuxarı Güləverli İsmayıl yeznəsinin qara sazını ondan alıb əmisi oğlu Əmirə hədiyyə edir. Hərdən Əmir öz dünyasına qapılanda heç kəsi eşitməz, "əlini ağdan-qaraya vurmazdı". Belə hallarda – Qurvanalının acığını tutduranda, xətrinə dəyəndə, sözünə baxmayanda o, sazı aşığın əlindən alırmış. Qurvanalının könlünə aşıq havası düşəndə sazı geri Əmirə qaytarıb çal-oxutdurarmış.

Aşıq Məhəmməd köçüb gedəndən sonra, Muxtar kişi sənətin yarımçıq qalmaması üçün Əmiri Cənubi Azərbaycandan Çürük Qəmərliyə (vaxtilə Bolnisi şəhərinin yaxınlığında yaşayış məntəqəsi –Ə.Y.), oradan



da Sarallar elinə gəlib özünə yurd-yuva quran, həm molla, həm də aşıq kimi tanınan Məşədi Söyünün (ona el arasında Tat Söyün də deyirdilər – Ə.Y.) yanına aparır: "A Maşadı Söyün, əl mənim, ətəy sənin, bizim Əmiri qoltuğunun altına çəy, sənəti başa vursun". Məşədi Söyün gənc Əmirin qabiliyyətinə bələd olduğundan onu şəyirdliyə götürür və oğlu Əmiraslanla birlikdə sənətin sirlərini cənubi aşıq məktəbi tərzində öyrədir. Məşədi Söyünün tələbkarlığı ilə Əmirin aşıq sənətinin sirlərinə üç ilə yiyələnməsi ona ustadın hörmət və sevgisini qazandırır. Güclü hafizəsi, möhkəm yaddaşı olan Əmir ustadı Məşədi Söyünün öyrətdiyi şeirləri, söylədiyi dastanları "ağızdan" götürürdü. Təəssüf ki, bu ustad-şəyird münasibəti də çox davam etmədi.

Məşədi Söyün "Stalin rejiminin" Türk xalqlarına və müsəlmanlara qarşı apardığı çirkin siyasətin "qurbanına" çevrilir. Təzəcə yerini "qızdırdığı" yurddan, qaynıyıb-qarışdığı Sarallar camaatından, varlığı qədər sevdiyi ailəsindən Məşədi Söyünü zorla ayırıb sürgün edirlər. O, gedəndə Əmirə deyir: "Oğul, sazı sinəndən qoyub zəhmətimi itirsən, gorum od tutub yanar. Sənəti yaşadan sənətkar ol".

Ustadına qarşı olan haqsızlıqlardan sarsılan gənc Əmir sənətə son qoymaq istəyir. Lakin sənətin, sazı-sözün qədrini bilən Muxtar kişi oğlunun mənəvi taleyinin uğursuzluğundan çox məyus olur. Oğlunun sənətdə uğur qazanması naminə əlindən gələni əsirgəmir. O, xeyli fikirləşdikdən sora qərara alır ki, Faxralı şair Nəbi oğluna dəyərli, mənalı söz və şeirləri öyrətsə, daha yaxşı olar. Elə də edir. Şair Nəbi iki ay Sarallarda, Muxtar kişinin ailəsində gənc Əmirə haqdan gələn şeirləri öyrədir.

Ustad Məşədi Söyünün təlimi nəticəsində, Cənubi Azərbaycan aşıq məktəbinin təsiri altına düşən Aşıq Əmir bir müddət cənublu aşıq qardaşlarımızın yolu ilə çalıb-oxuyur. Bu da yerli aşıqsevərlərin, hətta, Aşıq Əmirin özünə də xoş gəlmirdi. Kəpənəkçi Qasım İsmayılov və Qoçulu Aşıq Qəhrəman (1950-1952-ci illərdə Sarallarda Qasım kolxoz sədri, Qəhrəman isə hesabdar işləyirdilər. Qəhrəman kişi bu illərdə tez-tez Aşıq Əmirin yanına gedir, aşıq sənətinin sirlərini öyrənirdi – Ə.Y.) Əmirin

Borçalı aşıq məktəbi yolunda çalıb-oxuması üçün müvəqqəti qonşu Çataq kəndində yaşayan (1946-1956-cı ilə qədər Çataqda yaşayıb – Ə.Y.) Aşıq Söyün Saraçlı sənətindən bəhrələnməyi, ifa tərzini, avazını və ləmsini dəyişməyi məsləhət görürlər.

Aşıq Əmir Borçalı aşıq məktəbinin əvəzsiz yetirməsi, çalğısı, məlahətli səsi, şirin danışığı, aşıq sənətinin gözəl bilicisi və klassik aşıq havalarının mahir ifaçısı Aşıq Söyün Saraçlının ilk şəyirdi olur (təəssüflər olsun ki, bəzi aşıqlar Söyün Saraçlının ölümündən sonra özlərini onun "ilk şəyirdi" kimi ictimaiyyətə təqdim edirdilər). Beləliklə, Aşıq Əmirin Borçalı aşıq üsulunda çalıb-oxuması, sənətin sirlərini öyrənməsi üçün Aşıq Söyün Saraçlı şəyirdindən heç nəyi əsirgəmir və zaman keçdikcə zəhmətinin ilk nübarı kimi onunla oba-oba, oymaq-oymaq gəzib el şənliklərini, toy məclislərini birgə idarə edirlər. Aşıq Əmir bununla ustadın etimadını qazanır, üzünü ağardır. Aşıq Əmir Aşıq Söyün Saraçlının öyüd-nəsihətlərinə, məsləhət və təkliflərinə əməl edə-edə düz beş il ona həm şəyird, həm də yoldaş olur. Böyük ustad hərdən zarafatla Əmirə deyərdi: "Aşıq Əmir, sənin də çöpünə Söyünnər düşüf. Nə verifsən ki, bu Söyünlərdən alammersan?"

Aşıq Söyün Saraçlının xeyir-duaları ilə sənət dünyasına qədəm qoyan Aşıq Əmir müstəqil məclislər aparır. Qabiliyyəti, səhnə mədəniyyəti, şirin səsi, kövrək və yanıqlı zəngulələri gənc aşığı dilə-ağıza salır, hörmət qazandırır, aşıqsevərlərin sevimlisinə çevirir. Sənətə gəldiyi ilk illərdə Başkeçidin Hamamlı elinin gözəl sənətkarı, zurnaçı Alı Qara (mərhum ustad aşıq Hamamlı Vəkil Əliyevin əmisidir – Ə.Y.) 1956-1958-ci illərdə Aşıq Əmirin yanında balaban çalmış, bölgənin ağır toy məclislərini aparmışdılar. Lakin bu cütlüyün "ömrü" uzun olmur, çünki Borçalı aşıq sənəti ta qədimdən sırf sazla təmsil olunub.

Aşıq Əmir sənətə təsadüfi gəlməmişdi. Onu bu sahilsiz və dərin sənət dəryasında qəvvaslıq etdirən qəlbinin tükənməz arzuları, böyük xalq məhəbbəti idi. Aşıq Əmir bu sənətin sonsuz dərinliklərdən çıxardığı inciləri qan yaddaşına hopdurub, onlardan yeri gəldikcə istifadə edərək sənətdə özünəməxsus zirvəyə ucaldı, günəş kimi parladı. Aşıq Əmir şirin dili və ləhcəsi ilə, könül oxşayan ifa və səlis danışığı ilə dinləyicini ram edir, riqqətə gətirirdi.

**DAHA BİR SÖZARASI:** "Aşıq Əmir Ağbavalı ustad Aşıq Məhəmmədə şəyirdlik etdiyi illərdə Borçalının adlı-sanlı ustad aşıqları Aşıq Sadıqla qardaşı Aşıq Məmməd Sarallar elində Muxtar kişiyə qonaq olurlar. Ustad qardaşların qarşısında Aşıq Məhəmmədin şəyirdləri – Mehralı ilə Əmir çalıb-oxuyular. Aşıq Sadıq üzünü qonaqlara tutub

deyir: "Mehralını deyə bilmərəm, amma Əmir gələcəyin istedadlı və tanınmış aşığı olacaq".

Aşıq Əmir sadə insan olduğu kimi, həm də, təvəzökar və əvəzsiz aşıq idi. Onlarca aşıq havalarını ustadlarından öyrəndiyi kimi, klassik ölçü-biçimdə çalıb-oxuyar, dastanları ilkin variantdakı kimi danışardı. Onun ecazkar səsindən, xoş avazından, səlis danışığından doymaq olmurdu. Uzun və fasiləsiz zəngulələri, oxuduğu mənalı şeirlər ürəklərə qeyrət, könüllərə saf məhəbbət və yağı düşmənlərə nifrət hissləri oyadırdı.

Onun aşıq kimi ad-san almasında, hörmət qazanmasında və ustadlaşmasında müəllimləri Aşıq Məhəmmədlə Məşədi Söyünün, Aşıq Sadıqla Aşıq Xındı Məmmədin, Aşıq Söyün Saraçlıyla Aşıq Əmrahın, eləcə də, Faxralı şair Nəbinin böyük və əvəzsiz xidmətləri olmuşdur. O, həzin xalları və eydirmələri, yanıqlı boğaz xırdalıqları, şaqraq gülüşlü qaravəlli söyləmələri, çalıb-oxumaları ilə sevilib.

1992-ci ildə, ana təbiətin oyandığı, gül-çiçəklərin qönçələndiyi, xanım-xatun qızların durnagözlü bulaqların başına yığıldığı aprel ayının bir yaz günündə Aşıq Əmir dünyasını dəyişib haqqa, müqəddəslərin ruhuna qovuşaraq, anamız torpağın isti qoynuna köçüb əbədiləşdi.

Aşıq Əmir eldən gedən dəyərli insanlardan, ustad aşıqlardan biri idi. Hərdən fikirləşib təəssüflənirəm: "Niyə o da digər ustad sənətkarlar kimi vaxtında araşdırılıb üzə çıxmadı? O, çıraqla axtardığımız saz-söz "xəzinələrini", klassik aşıq ədəbiyyatının yazılmamış, işıq üzü görməyən, "xoruz səsi eşitməyən" aşıq poeziya incilərini və bir çox dastanlarımızın ilkin variantını özü ilə apardı. Aşıq Əmir sadəliyindənmi, təvəzökarlığındanmı, halallığındanmı, yoxsa, hamını özü kimi bildiyindənmi "üzə çıxa bilmədi"?

Aşıq Əmir xalqın müqəddəs və tükənməz mənəvi sərvətini, ağır yükünü qəlbinin dərinliyində daşıyırdı.

Aşıq Əmirlə söhbətimiz zamnaı belə deyərdi: "Qardaşoğlu, Dədə Qorqudun əsl törəmələri biz Borçalılarıq. Bizim suyumuzun hər damlasınnan, havamızın hər udumunnan, torpağımızın hər qarışınnan, dağımızın-aranımızın hər yerinnən saz ətri gəlir, saz havası duyulur. Bavalarımız da, biz də aşıx havalarınnan mayalanmışıx. Qarabağıllar "muğam" üstə ağlıyan kimi, biz də saz üstə – "Mansırı", "Dilqəmi", "Qaraçı", "Urfani", "Məmmədbağırı", "Yanıq Kərəmi" üstə ağlıyırıx".

Oğlunun vaxtsız faciəli ölümü Aşıq Əmiri çox sarsıtdı. Bir müddət sazı əlinə almadı. Qohum-qardaşın, dünya görmüş kişilərin, ustad aşıqların məsləhət və xahişi ilə yasdan çıxdı, məclislərə getdi. Bu itkidən sonra o, həmişə qəmli və kövrək havalar oxuyardı.

**Sabir SADAXLI**



# BİR DƏRVİŞƏM, SÖZDÜ YÜKÜM

El şairi İsmixan Cəfərli 1951-ci ildə Borçalının ağır ellərindən olan Sadaxlı kəndində dünyaya göz açıb. 1968-ci ildə Sadaxlı kənd orta məktəbini bitirib. Ordu sıralarında xidmətdən sonra ömrünün sonuna kimi doğma Sadaxlıdan uzaq düşməyib. Ali savad dalınca da getməyib. Zəhmətkeş, din-iman sahibi, halal bir insan kimi ömür sürüb.

İsmixanın düz iyirmi il əvvəl işıq üzü görmüş "Döyünən ürək" şeirlər kitabını vərəqləyirəm. Elə ilk şeirdən Allaha, onun rəsuluna, müqəddəs dinimizə, Vətənə, xalqına bağlı imanlı bir könül adamı olduğu görünür:

*Yolunda qolları bağlı qulam mən,*
*Salma nəzərindən, ey qadir Allah.*
*Bizə də qismət et qiyamət günü*
*Abi- kövsərindən, ey qadir Allah.*

İlk şeir nümunələrini hələ orta məktəbdə oxuyarkən qələmə alıb. Aşıq Məhəmməd Sadaxlı, el şairi Yetim Mahmud, Əhməd Sadaxlı, şairə Səadət Buta kimi sənətkarlar şairin yaradıcılığına yüksək qiymət vermişlər. Yaxşı saz çalmağı, gur səsi var idi. Aşıqlıq dalınca getsəydi, bəlkə də bu gün adı ustadlar sırasında çəkilərdi...

*Bu oba mənimdi, bu mahal mənim,*
*Sanmayın elləri az dolanmışam.*
*Elin şən günündə, elin toyunda,*
*A dostlar, sinəmdə saz dolanmışam...*

Dünya, zaman, insan problemləri onun yaradıcılığının ana xəttini təşkil edir. Dünyaya, zəmanəyə giley-güzarı çox məharətlə verə bilib şeirlərində. İnsan – dünya, həyat – ölüm fəlsəfəsini şair ustalıqla açmağı bacarıb:



*Qaynar qazan kimi, hey coşub-daşır,*
*Qoymur ki, bircə an dinə dərdimi.*
*Dərd üstə dərd gəlir kor zəmanədən,*
*Yoxsulluq çatdırıb minə dərdimi.*

Zəmanədən gileylənən şair özünə başqa şeirində cavab verir:

*Dərdsiz insan varmı, ey insan oğlu?*
*Bulayıb yeyirəm bala dərdimi.*
*Haqqa yalvarıram, rəva görməsin*
*Yazıqdı, verməsin qula dərdimi...*

Şair el-obasının, xalqın, yaddaşında qalacağına inanır, getdiyi müqəddəs yolda mətinliyini bildirir:

*İsmixan can verir mərəz əlində,*
*Ölmərəm, yaşasam elin dilində,*
*Dəvəsiz ərəbəm Yəmən çölündə,*
*Cəkərəm, dərdinə cula dərdimi...*

Doğulub boya-başa çatdığı Borçalını dünyanın ən dilbər guşəsi, dağlarımızı, yaylaqlarımızı, ana təbiətimizi ən səfalı məkana – cənnətə bənzədir. Elimizin böyüklüyünü, ağırlığını, eloğlularımızın qəhrəmanlığını, mətinliyini bütün yaradıcılığı boyu tərənnüm edir. Canından çox sevdiyi Borçalı şairin öz dünyası, öz kainatıdır. Onun üçün Borçalı yer üzünün ən gözəl diyarı, dədə-babalarımızın ən müqəddəs (həm də ən böyük) məkanı, sivilizasiyanın ən qədim məskənlərindən biridir.

Şairin yaradıcılığında Vətən, yurd, müqəddəs türbələrimiz, inanc yerlərimiz, nankor qonşularımızın əsarətində qalan Loru, Ağbaba, Pəmbək, Calaloğlu, Allahverdi və neçə-neçə adı çəkilməyən Borçalı torpaqlarımız xüsusi yer tutur. İndi Ermənistan adlanan ölkə ərazisində qalmış tarixi torpaqlarımızın ilkin adları İsmixan Cəfərlinin şeirlərində tarixçi-etnoqraf məharətilə verilmişdir. Elə Gürcüstan ərazisindəki adı dəyişdirilmiş yaşayış məskənlərimizi də bu aqibət gözləyirdi. Yaxşı ki, şair İsmixan kimi söz adamlarımız, aşıqlarımız qədim toponimlərimizi yaradıcılıqlarında qoruyub saxlayıblar. Şair İsmixanın "Borçalının xəritəsi" şeiri bunun bariz nümunəsidir:

*Məndən Borçalını soruşan dostum,*
*Borçalı dediyin ağır mahaldır.*
*Qeyrət simvoludur hər qaya, hər daş,*
*Borçalı dediyin ağır mahaldır...*

Şair şeirlərinin əksəriyyətini heca vəznində yazmış, ozan-aşıq şeir nümunələrini oxuculara məharətlə çatdıra bilmiş,, yer adlarını şeirlərində istifadə etməyə üstünlük vermişdir:

*Yoluna düş "Şamdüyə"nin,*
*"Göy bulaq"dan su iç sərin.*
*Görəcəksən "Sarp dərə"nin*
*Dibindəyəm, aşıq qardaş.*

*Qoca "Ləlvər", "Qızıl qaya",*
*"Əyriqar"da qarış çaya,*
*Çobanların yetər hoya,*
*Yol çaşanda, aşıq qardaş.*

Yerli şivə, ləhcə, el sözləri də şairin yaradıcılığında geniş istifdə edilmişdir.

*Topla gətir hər nübarı,*
*Kim sevmir ki tər nübarı!*
*"Quzqulağı", "Qulançar"ı*
*Könlümün uman vaxtıdı.*

*Bulaqların başına gəl,*
*Mənə "Xatınbarmağı" dər,*
*"Sozu", "Xımı" ye, dada gəl,*
*Güllərin açan vaxtıdı.*

Şair din-imanlı, Turan sevdalı Türk oğlu olmağından qürur duyur:

*İnamım var, imanım var,*
*Ayətim var, Quranım var,*
*Dünya boyda Turanım var,*
*Qarapapaq Türk oğluyam...*

Doğulduğu torpaqdan heç vaxt ayrı yaşamayan şair aranlı-yaylaqlı Sadaxlı elini bütün varlığı, vücudu ilə sevib, hər sevincinə, kədərinə şeirlər qoşub. Gəzdiyi meşələrinə, çəməninə, çiçəyinə, hər qayasını, daşına, gözündən su içdiyi buz bulaqlarına minnətdar olduğunu ilhamla qələmə alıb:

*Başın qurana bağlıdı,*
*İmanlısan, ay Sadaxlım.*
*Qədirbilən insanlara*
*Vəfalısan, ay, Sadaxlım.*

*Ağır ellərin pirisən,*
*Borçalının gövhərisən,*
*Ləlvər dağının ləlisən,*
*Səfalısan, ay Sadaxlım...*

Təbiətlə təmasdan doymayan şair təbiətin bir zərrəsinə çevrilir, onu vəsf etməkdən doymur:

*Dur gedək yaylağın sərin qoynuna,*
*Şır-şır bulaqlardan içməsək olmaz.*
*Çiçəkli dağların əhvalın sorub,*
*Çaylarla danışıb dinməsək olmaz...*

Onun aşıq şeir nümunələri – təcnis, gəraylı, müxəmməsləri aşıqlqrımızın ifasında səslənib...

İsmixan Cəfərli Borçalının, ümumlikdə, xalqımızın dəyərli, sinədəftər oğludur. Mən Zəlimxan Yaqubun gəzən ensiklopediya olduğuni, söz qarşısında aciz qaldığını heç vaxt görməmişəm və yazılarımda da bunu dəfələrlə qeyd etmişəm. İkinci hzırcavab və sinədəftər şairimizin İsmixan olduğunu çəkinmədən qeyd eməyi özümə borc bilirəm.

*Yolun düşsə hərgah bizim ellərə,*
*Əhli mərifət, düz insanı görərsən.*
*Borçalının vəsfi düşüb dillərə,*
*Təriqətdə yol ərkanı görərsən*

– deyən el şairi Yetim Mahmud "Görərsən" rədifli şeirini də İsmixanın adını zəmanəmizin "Söz peyğmbəri" Zəlimxan Yaqub və ustad aşıqlarımızla yanaşı çəkir, onun hazırcavablığını qeyd edir:

*...Nur olsun gecəsi, hər bir sabahı,*
*Açılsın üzünə haqqın dərgahı .*
*Ömrün Nizamisi, şairlər şahı,*
*Haqq şairi Zəlimixanı görərsən...*

*...Məhəmməd Sadaxlı ustaddı, tanı,*
*Qəlbində pünhandı neçə dastanı.*
*Əhməd Sadaxlıdır söhbətin kanı,*
*Tuti dilli xoş səfanı görərsən...*
*... Hazırcavab İsmixanı görərsən...*

İsmixan Cəfərli həm də ozan-aşıq sənətindən bəhrələnmiş sevgi, məhəbbət şairidir. Hələ gənc yaşlarında heç bir aşığa şəyirdlik etmədən saz çalmağa, məclislərdə çox məharətlə yapışıqlı, məlahətli və gur səsilə mahnılar oxumağa başlamışdı. Aşıq sənətinin dalınca getsəydi bəlkə də ən uca zirvələrə qalxa bilərdi. Şeirlərinin əksəriyyətini bədahətən ərsəyə deyərdi.

Qeyd etdiyim kimi, İsmixan gözəllik, eşq, məhəbbət aşiqi idi. Onun ilham pəisi elə ocağının başında şairin ruhunu qoruyan, balalarına həm atalıq, həm də analıq edən həyat yoldaşıdır. Yetər xanımın İsmixana olan məhəbbəti o, fani dünyanı tərk edəndən sonra daha da müqəddəsləşib. Şairin əlyazmalarını necə məhəbbətlə, müqəddəs kitab kimi bu sətirlərin müəllifininin qarşısına qoyaraq: “Sabir qardaş, İsmixan bunları Sizə çatdırmağı vəsiyyət elədi”, – deyərkən, onun ruhən bircə an da ömür-gün yoldaşından ayrılmadığının şahid oldum. Üzün ağ olsun anam-bacım!!!

*Qismət yazılanda, pay bölünəndə*
*Mənimtək zənbura yol verib fələk.*
*Sən güldən-çiçəkdən, vallah, gözəlsən,*
*Sənin dodağına bal verib fələk.*

*Söylə, şairlərin nədir günahı?*
*Qələmdi, kağızdı, sözdü silahı.*
*Sənə gözəlliyi, mənə tamahı*
*Mən yazıq neylim ki, bol verib fələk...*

Borçalı eli saza, sözə məftun, körpəsindən tutmuş ağsaqqlına kimi əksəriyyətinin sinəsi dolu, boğazı zənguləli, nənələrin, qız-gəlinlərin dili qımqımılı, laylalıdır. Şair İsmixanın təmsil olunduğu Cəfər öyü də bu qəbildəndir. Azərbaycan Dövlət filarmoniyasının solisti Fərman Cəfərov

da bu nəslin nümayəndəsidir. Yetmiş iki yaşlı xanəndənin səsi, avazı indi də yerindədir.

Ruhun şad olsun, şair! Son nəfəsinə qədər elimizdən, eloğlularımızdan yazdın. Heç kimdən nagüman, heç kəsdən gileyli getmədin. Son günlərində ziyarətinə söz adamlarının, el şairlərinin dəstə-dəstə gəldiklərinin şahidiyəm.

Heyif, o, Bakı ədəbi mühitindən kənarda qaldı, söz sərrafları məclislərinin qazanında qaynamadı. Amma bir tərəfdən də xoşbəxt şairdir ki, sağlığında şeirləri dillər əzbərinə çevrildi, aşıqlarımızın ifalarında səsləndi, bir neçə kitabı çap olundu. Şairin son gunlərində dəfələrlə ziarətində oldum, bitib-tükənməz təbinin aşıb-daşdığının şahidi oldum. Son dəqiqələrinə qədər şeir yazdı, elə seirlə də bu fani dünyanı tərk etdi. Ölümün gözünə dik baxdı, son şeirini də gülə- gülə deyib əbədiyyətə qovuşdu:

*Görüşünə gülə-gülə*
*Gəlirəm,atam, gəlirəm.*
*Köçürəm yeni mənzilə,*
*Gəlirəm, atam, gəlirəm.*

*Ölüm xofun elə sayma,*
*Erkən yazıldı payıma.*
*Əbədiyyət sarayıma*
*Gəlirəm, atam, gəlirəm...*

Ruhun cənnətdə bərqərar oldu, böyük şair! Neçə ki Azərbaycan xalqı var, sənin xatirəni yaşadacaq, şeirlərini gələcək nəsillərə aparacaq...

**P.S. *Şair İsmixan Cəfərli mənim sinif yoldaşım, uşaqlıq dostumdur. Ağsaqqallarımızın dediyinə görə tarixi araşdıra bilsək, bir kökə bağlıyıq.***

***Dünyanın qəribə işləri var – onun ilk şeirini də mən oxumuşam, son şeirlərini də çapa mən hazırladım... Səkkizinci sinifdə oxuyurduq. Utana-utana mənə bir dəftər vərəqi uzatdı. Oxudum – şeir idi. O zaman aşıqlıq edən, indi arıçı kimi tanınan İbrahim Bedilliyə göstərdik. Allah ömür versin, sındırmadı gənc şairi: "Yaz oğlum, yaxşı şeirdi. Sən mütləq şair olacaqsan!.."***

*İsmixan CƏFƏRLİ*

**DÜNYA**

Xaliqin qüdrəti yaradıb səni –
Naxışın, bəzəyin pozulmur, dünya.
Qanlar selə donüb axır sinəndə,
Günahın heç yerə yazılmır, dünya.

Hardandı, bilmirəm, belə sevilmək
Dövranın boynuma taxıbdı ilmək.
Qoynuna atılan istəmir ölmək,
Sənə məhəbbəti azalmır, dünya.

Əyilməz başları çarmıxa verdin,
Şöhrəti, sərvəti yaltağa verdin,
Sözün kəsərini alçağa verdin,
Doğru danışanın ucalmır, dünya.

El qəhri çəkənlər zülmətdə yatır,
Şeytanlar çoxalıb, aranı qatır.
Bu dərd İsmixanı vaxtsız qocaldır,
İrsizin, sarsağın qocalmır, dünya.

**QOCALIQDADI**

Xətrinə dəyirsə, həddini bilməz,
Günah məndə deyil, qocalıqdadı.
Getdi cavanlığım, bir daha dönməz,
Günah məndə deyil, qocalıqdadı.

Daha söz xətrimə tez dəyir, qardaş,
Ürəyim kaman tək sızlayır, qardaş,
Dizlərim bükülür, büdrəyir, qardaş,
Günah məndə deyil, qocalıqdadı.

Könlüm viranədi, gözlərim gülməz,
Ağlasam, yaşımı gözəllər silməz.
Yalvarsam, ötən gün bir daha dönməz,
Günah məndə deyil, qocalıqdadır.

İsmixanam, haqqın kölgəsindəyəm,
Keçmişəm, fələyin ilməsindəyəm,
Daha o dünyanın həvəsindəyəm,
Günah məndə deyil, qocalıqdadı.

**GƏLMİŞƏM**

Ayrılıq vaxtıdır, bu son məqamda
Əcəl sərbətimi içib gəlmişəm.
Budur son mənzilim, budur məkanım,
Əbədi dünyaya köçüb gəlmişəm.

A dostlar, xəbərniz varmı halımdan?
Ayrıldım elimdən, xanimanımdan,
Mən daha bezmişəm sirin canımdan,
Fələyin cənginə keçib gəlmişəm.

Daha qocalmışam, yaşlar aparıb,
Ömrümü şaxtalar, qışlar aparıb,
Daşınıb sümbülüm, quşlar aparıb,
Ömür kövşənimi biçib gəlmişəm.

Ayrılıq, ölüm var – mən nə bimişdim?!
Bu zalım dövranın oynuna düşdüm.
Daim şəfəq saçan bir günəşiydim,
Vətən səmasında saçıb gəlmişəm.

**NƏ UMASIYAM**

Yeyən yedi, içən içdi,
Dünyadan nə umasıyam?
Yaxşı-yaman ömrüm keçdi,
Dünyadan nə umasıyam?

Yarananda qul yarandım,
Yatıb, qəflətdən oyandım,
Gah yeridim, gah dayandım,
Dünyadan nə umasıyam?

Daha şən günlərim getdi,
Cavanlığım gözdən itdi,

Ömrüm gəldi, sona yetdi,
Dünyadan nə umasıyam?

Verdi əcəl piyaləsin,
Mən çox çəkmişəm şələsin,
İnnən belə ləl ələsin-
Dünyadan nə umasıyam?

İsmixanı unutmayın,
Hərdən gəlib yoxlayın,
Bu dünya oyundur, oyun-
Dünyadan nə umasıyam?

**YARAŞMIR**

Bu yurda el sevən oğullar gərək,
Nanəcib, naxələf, gədə yaraşmır.
Dünyanı qənirsiz yaratdın, Allah,
Heyif ki, dünyaya bəndə yaraşmır.

Oğul gərək işıq saça, Ay ola,
Çalxalana, dağdan axan çay ola,
Dar günündə Vətəninə pay ola,
Gizlənmək arxada, tində - yaraşmır.

İsmixan arifdi, yadında saxla,
Yalanım vardısa, sinəmdən oxla,
Dostu gendə ara, çətində yoxla,
Namərdi ha sına, min də yaraşmır.

**GƏLƏ BİLMIR**

Fikrindən nə keçir, ay dəli könlüm?
Qocaldım, əlimdən iş gələ bilmir.
Çaşıb mənzilini, azıb yolunu
Ayaq gedən yerə baş gedə bilmir.

İnsanın qeyrəti, adı varıydı,
Hamının doğması, yadı varıydı,
Dünyanın ləzzəti, dadı varıydı,
Bu gərdiş heç kəsə xoş gələ bilmir.

Dünya dərdə düşüb, kəsilib güman,
Zalıma, cəllada nə haqq, nə divan?!
Öldürüb-ölməyə öyrəşib insan,
Heç kəsin gözündən yaş gələ bilmir.

İsmixanam, ürəyimə qor düşüb,
Zəmanə insanla yaman öcəşib,
Fəsillər donunu elə dəyişib,
Əzəlki qaydada qış gələ bilmir.

**ALLAH**

Bu necə gərdişdi, bu necə zaman?
Gül kimi saralıb, soluruq, Allah.
Dövranmı yorulub, insanmı çaşıb?
Ehtiyac içində qalırıq, Allah.

Yaman düyün düşüb kələfin ucu,
Zəhmətkeş əllərin boş qalıb ovcu,
Qismət ceyran olub, biz naşı ovçu-
Nə xam xəyallara dalırıq, Allah!

Alim də, mömün də mat qalıb düzü,
Əl açıb, göylərə dikilib gözü,
İtib çöhrəmizdən sevincin izi,
Dərdi qalaq-qalaq alırıq, Allah.

**Rahilə QARALOVA**



***Rahilə Seyfəddin qızı Qaralova 1967-ci il noyabrın 28-də Gürcüstanın Dmanisi (Başkeçid) rayonundakı Şahmarlı kəndində anadan olub. Şahmarlı kəndindəki 8-illik və Dmanisi şəhər 2 saylı Azərbaycan orta məktəbinidə oxuyub, sonra təhsilini Tbilisi şəhərində Maliyyə Texnikumunda davam etdirib. Bir müddət Dmanisidəki 147 saylı texniki-peşə məktəbində çalışıb. Hələ orta məktəbdə oxuyarkən şeirləri mətbuatda çap olunub. "Qərib həsrəti", "Məndən nağıl umma, dünya" adlı kitabların müəllifidir.***

## SAZIM

Dağı yerindən oynadıb,
Sinəm üstə duran sazım,
Meydanlarda at oynadıb,
Toy-məclislər quran sazım.

Yandırıbdı "Kərəmi"ylə,
Qəm veiribdi "Dilqəmi"ylə,
"Koroğlunun cəngi"siylə,
Qılınc-qalxan vuran sazım.

Məhəbbəti eldən aldın,
Çox dövranlar yola saldın.
Şahlar ilə qonaq qaldın,
Namərdləri qıran sazım.

Dədə Oorqud yadigarı,
Qoruyubsan düz ilqarı.
Yol alıbsan bizə sarı,
Əsrləri yoran sazım!

İlham verdin yenə mənə,
Alqışladım dönə-dönə.
Rahilə də olub sənə,
Lap əzəldən heyran, sazım.

## BORÇALI

Onun gözəlliyi Allahdan gəlib,
Bütün gözəlliyin gözü Borçalı.
Seyr etdim çəmənin çiçəklirini,
Bütün çiçəklərin özü Borçalı.

Təbiblər, loğmanlar seyrinə çıxdı,
Gələn mehmanları əlini sıxdı,
Hər kəsin könlünə nur kimi axdı,
Ürəkdə məhəbbət közü Borçalı.

Nə qədər söz desəm, yenə də azdı,
Sevənlər köksündə çaldığı sazdı,
Qışda da, yayda da havası yazdı,
Ozanlar, aşıqlar sözü Börçalı.

Gözəllik donuna bürünüb hər yan,
Hər baxan hüsnünə olubdu heyran.
Rahilə gözündə sanki bir ceyran,
Gürcüstan elinin gözü Borçalı.

## ÇƏKİR

Başına döndüyüm nazlı dilbərim,
Həsrət bizi hara çəkir, nə çəkir.
Görən sən də mənim kimi yanırsan?
Ürəyimə yara çəkir, nə çəkir.

Ağlamaqdan kor olubdu gözlərim,
Səni gəzdim tutulubdu dizlərim.
Hay salıram, sənə çatmır sözlərim,
Ağ bəxtimə qara çəkir, nə çəkir.

Bilirəm ki sən də məni anırsan,
Rahilə, sən həsrətdənmi yanırsan?
Mən deyəni anlayırsan, qanırsan?
Eşqin məni dara çəkir, nə çəkir.

**YARIM**

Qəm yükünü unut getsin,
Ay qürbətdə olan yarım.
Gəl görüşək, həsrət bitsin,
Ay həsrətdə qalan yarım.

Gəl sevgimi dara çəkmə,
Saf eşqimə qara çəkmə,
Gül bağımda tikan əkmə,
Sevgi bağı talan, yarım.

Rahilə də sənə qurban,
Heç unutmaz səni bir an,
Bu sevgidə mərd ol, dayan,
Olma əhdə yalan, yarım.

**DAĞLARIN**

Qəlbimə hakimdi, ruhuma qənim,
Məni məndən alır gülü dağların.
Ürəyi coşdurur, qəlbi coşdurur,
Sinəsindən axan seli dağların.

Çoban tütəyidi ana laylası,
Zirvəsində qarı olub aynası,
Gözəlliyi bir-bir deyib saylası,
Çeşməsi, bulağı ləli dağların.

Baharda al yaşıl dona bürünər,
Ətəyində lalə nərgiz görünər,
Zirvəsində sazaq, çiskin sürünər,
Dumandan çəkilmiş tülü dağların.

Ayrılıq həsrəti nədir, bilirəm,
Vətən, həsrətindən hər an ölürəm,
Qəm çəkir, ağlayıb hərdən gülürəm,
Eyləyib məni də dəli dağların.

**DÜŞMÜŞƏM**

Yollarım bağlanıb, gələ bilmirəm.
Yağışa, borana selə düşmüşəm.
Gözyaşım çağlayıb ümmanlar kimi,
Həsrət vadisində gölə düşmüşəm.

Bilmirəm qarğıyan kim oldu mənə,
Düşmüşəm dağlarda dumana, çənə.
Yolumu azmışam, nə oldu mənə?!
Məcnun tək səhraya, çölə düşmüşəm.

Adım da yadımdan çıxır, ölürəm,
Səni yuxumda da ağlar görürəm.
Əzizim, darıxma bir gün gələrəm,
Elə bil, fitnəyə, felə düşmüşəm.

Sənsiz xəstə düşüb canım, ağrıyır,
Ürəyim sızlayır, qanım ağlayır.
Mənim yollarımı hicran bağlayır,
Kərəm tək alışıb külə düşmüşəm.

Bu sevgi yandırdı, canımı aldı,
Fərhad tək tişəni dağlara çaldı,
Rahilə, gülüzlü sevdası qaldı,
Ağızdan-ağıza, dilə düşmüşəm.

# MÜNDƏRİCAT

# OZAN DÜNYASI

***(elmi-publisistik, ədəbi-bədii jurnal)***

***Texniki redaktor: Elşad Çobanlı***

*Yığılmağa verilmiş 15.09.2018*
*çapa imzalanmış 26.10.2018*
*Şərti çap vərəqi 5,5. Sifariş № 332.*
*Kağız formatı* ***70x100*** *1/16. Tiraj 350*
*Əlaqə tel: +994503453652*
*musa58@bk.ru*

*Jurnal* ***«Elm və təhsil»*** *nəşriyyat-poliqrafiya müəssisəsində hazır diapozitivlərdən çap olunmuşdur.*